# Şərh əs-Sunnə

شَرْحُ السُّنَّةِ

للإمام أبو محمد البربهاري

İmam

Əbu Muhammməd əl-Bərbəhəri

www.favaid.com

شرح السنة

# Şərh əs-Sunnə

إمام أهل السنة والجماعة في عصره

أبو محمد الحسن بن علي بن خلف البربهاري

المتوفى سنة ٣٢٩ هـ


**Əhlus-Sunnət val-Cəməatın öz əsrində imamı**

**Əbu Muhammədəl-Həsən bin Ali bin Xaləf əl-Bərbəhəri**

vəfatı hicri 329-cu il


tərcümə

**Samir Firdovsioğlu**

## Mündəricat

## Tərcüməçinin müqəddiməsi

Bizi İslam dini ilə nemətləndirən, nəfsimizi idarə etmək üçün bizi əql ilə təchiz edən aləmlərin rəbbi Allaha sonsuz həmd olsun! Onun nemətləri saymaqla bitməz, bizə göstərdiyi lütfü və mərhəməti düşünməklə əhatə olunmaz! İnsanlara rəhmət olaraq göndərdiyi sonuncu elçisi, bəşəriyyətin ağası, yaradılmışların ən xeyirlisi Muhamməd Mustafaya ən əfsəl salavat və salam olsun. Həmçinin onun ailəsinə, ona çətinliklərdə yoldaşlıq etmiş səhabələrinə və ona Qiyamət gününə qədər tabe olacaq hər bir kəsə Allahın salavatı və bərəkəti olsun!

Mən şahidlik edirəm ki, Allahdan başqa ibadətə layiq haqq bir məbud yoxdur. O, Təkdir, heç bir şəriki yoxdur! Bütün gözəl isim və sifətlər Ona aiddir. Şahidlik edirəm ki, Muhamməd Onun qulu, sevimlisi və elçisidir. Risaləti təbliğ etdi, əmanəti yerinə yetirdi, ümmətinə nəsihət etdi, Allah onun əli ilə insanların dərdini qaldırdı və ölənə qədər Allah uğrunda haqq ilə cihad etdi.

Allahın qullarına verdiyi ən böyük nemətlərdən biri də oxumaq və dərk etmək nemətidir. Bunun sayəsində insan övladı elmi qoruya bilmiş və nəsildən nəsilə ötürə bilmişdir. Yalnız ağıl sahibləri bu nemətin əzəmətini dərk edə bilər. Məhz bu imkanın sayəsində biz bu gün əsrlər əvvəl qələmə alınmış kitabları vərəqləyə bilirik, onlardan yararlana bilirik. Səhabə dönəmindən sonra yaşamış müsəlman alimlər elmi kitablara qeyd etməyin və onu sonrakı nəsillərə ötürməyin əhəmiyyətini gözəl anlayırdı. O zaman əqidə, təfsir, hədis, fiqh və daha bir çox fəndə kitablar yazılmışdı. Bu yöndə ən vacib vəsait əqidə mövzusunda yazılmış kiçik və böyük kitablar idi. Bu dəfə sizə təqdim edəcəyimiz kitab da hicri üçüncü əsrin sonu və dördüncü əsrin əvvəlində yaşamış böyük islam aliminin yazdığı bir kitabdır. Əbu Muhamməd əl-Bərbəhəri adı ilə tanınan bu böyük alim islam xilafətinin paytaxtı, elmin mərkəzi olan Bağdadda yaşamış və orada fəaliyyət göstərmişdir.

Yazdığı kitab alimlər yanında “Şərhus-Sunnə” adı ilə tanınır və müsəlmanlara xitab olaraq onları bidətlərdən çəkindirmək və sünnətə tabe olmağa çağırmaq məqsədilə yazılmışdır. Kitabın öz həcmində çox faydalı olduğunu düşünürük, çünki kitab o zamanın elmi mühitini özündə təmsil edir, əsas məsələlərə toxunur.

## Kitabda gördüyümüz işlər

Bu işimizdə kitabı tərcümə etməklə kifayətlənmədik, lakin onu oxucu üçün daha faydalı etmək məqsədi ilə orta çaplı bir təhqiq işi gördük. Kitabda bir çox məsələ haqqında kifayət qədər məlumat vermişik, lakin bununla belə məsələlərin haqqını verdiyimizi düşünmürük.

Kitabın əvvəlində müəllifin həyatı haqqında, kitabın əlyazması haqqında və kitabın müəllifə nisbəti haqqında bir qədər məlumat verdik. Kitabın müəllifə nisbəti haqqında müasir dövrdə ortaya bəzi şübhələr atıldığı üçün o şübhələr qısa olaraq cavab verməyə çalışdıq.

əl-Bərbəhərinin "Şərhus-Sunnə" kitabı bir çox şeyx tərəfindən təhqiq olunub və çap olunub. Kitabı ilk dəfə Muhamməd bin Said əl-Qahtani təhqiq etmişdir və hicri 1408-ci ildə çap etmişdir. İkinci təhqiq Xalid bin Qasim ər-Raddədi'yə aiddir. Əldə edə bildiyimiz ən son təhqiq isə Abdur-Rahmən bin Əhməd əl-Cəmizi'yə aiddir. Bunların arasında gördüyümüz ən dəqiq təhqiq əl-Cəmizi'yə aiddir və tərcüməmizdə əsasən ona əsaslanmışıq.

Onu da qeyd etməliyik ki, kitab ərəbcə çap olunmuş orijinal şəklində rəqəmlərlə müşaiyət olunan hissələrdən ibarətdir. Fərqli təhqiqlərdə hissələrin rəqəmləri fərqlənir. Biz tərcüməmizdə rəqəmlərin təyin olunmasında hər hansı bir təhqiqə əsaslanmadıq, lakin özümüzün uyğun gördüyümüz mənaya uyğun olaraq hissələrə ayırdıq.

Hədislərin təxricində izlədiyimiz metod belədir ki, əl-Buxari və Muslimin və ya onlardan birinin rəvayət etdiyi hədisdə yalnız onların rəvayət etdiyi hədisin rəqəmini qeyd etməklə kifayətləndik. "əs-Sünən" kitablarına və digər kitablara nəzər salmadıq. Çünki ümmət əl-Buxari və Muslimin "əs-Sahih" kitablarını səhih olaraq qəbul etmişdir. Digər kitablarda keçən hədislərin təxricini bir qədər geniş tutduq və səhihliyi barəsində söz açdıq. Sələfin alimlərindən nəql olunan sözlərdə isə yalnız qaynaqları qeyd etməklə kifayətləndik.

Mündəricat üçün kitabı başlıqlara ayırdıq. Lakin kitab özü müəyyən bir mövzu məcrasına tabe olmadığı üçün, yaxın mövzular bir-birini izləmədiyi üçün başlıqları ayırmaq xüsusilə çətin idi. Ona görə də bəzi yerlərdə başlıq yerləşdirmək əvəzinə, sadəcə olaraq üç ulduz rəmzindən istifadə etmişik.

Kitabında sonunda bu təhqiqdə istifadə etdiyimiz ədəbiyyatın siyahısını təqdim etmişik. Kitabları azərbaycan əlifbası sırasına uyğun olaraq tərtib etmişik.

Onu da zikr etməliyik ki, istənilən halda bu kitabın tərcüməsi və tərcümənin üzərində görülmüş iş insan övladının əməyidir. Kitabda xətanın olması labüddür. Xətadan təmiz olan yalnız ər-Rahmənin kəlamıdır. İman edərək deyirik ki, kitabın içindəki bütün doğrular Allahdandır, Onun verdiyi lütf və nemət sayəsindədir. Bütün xətalar isə öz naqis təbiətimizin nəticəsidir. Allah bu işimizi qəbul etsin və onu axirətimiz üçün əcr qaynağı etsin! Allahdan bu kitabı azərbaycanlı müsəlmanlar üçün faydalı etməsini diləyirəm!

## Müəllifin tərcüməsi

Əbu Muhamməd əl-Həsən bin Ali bin Xaləf əl-Bərbəhəri öz zamanında hənbəlilərin şeyxi olub. əl-Bərbəhəri adı "bərbəhər" sözünə nisbət olaraq verilib və bu, Hindistandan gətirilən ədviyyat adıdır. Bu cür ədviyyatları gətirənlərə "bərbəhəri" deyərdilər.[1]

Tarixi qaynaqlar onun doğum tarixi barədə bir məlumat vermir, lakin onun hicri 329-cu ildə vəfat etməsi barədə qaynaqlar arasında razılıq vardır. Onun 76 və ya 77 il yaşadığı qeyd olunub və buna əsaslanaraq onun ya 252-ci ildə, ya da 253-cü ildə doğulduğunu demək olar. Lakin Mucirud-Din əl-Uleymi onun 96 il yaşadığını deyir və buna əsaslansaq onun 233-cü ildə doğulduğunu söyləməliyik. Lakin əvvəlki tarix daha möhtəməldir.

əl-Bərbəhəri elm təhsilində İmam Əhmədin əshabından bir çox zatdan elm öyrənmişdir. Onlardan ikisini burada qeyd edirik:

1. Əhməd bin Muhamməd bin əl-Həccəc bin Abdil-Aziz Əbu Bəkr əl-Mərruzi; İmam Əhmədin ən öncül tələbələrindən biridir, çünki təqvası və fəzilətinə görə seçilirdi. İmam Əhməd onunla yoldaşlıq edərdi. İmam Əhməd öldükdə onun gözünü bağlayan və onu yuyan da məhz əl-Mərruzi olmuşdur. Hicri 275-ci ildə vəfat edib.

2. Əbu Muhamməd Səhl bin Abdilləh bin Yunus bin İsa bin Abdilləh ər-Rafi ət-Tustəri; məşhur bir salehdir, çoxlu moizələr və kəramətlər sahibidir. Hicri 283-cü ildə vəfat edib.

əl-Bərbəhəri'nin çoxlu tələbələri olub və bir çox böyük alim onun əlindən elm almışdır. Onun tələbələri arasında böyük imamlar vardır. Onlardan bəzilərini burada zikr edək:

---

[1] Bunu Əbu Sad əs-Səm'ani "əl-Ənsəb" kitabında (1/307) və İbnul-Əsir "əl-Lubəb fi Təhzib əl-Ənsəb" kitabında (1/133) zikr edir.

1. Ubeydullah bin Muhammәd bin Muhammәd bin Hәmdәn bin Bәttah әl-Ukbәri Әbu Abdillәh әl-Bәtti; böyük imam, fәqih vә mühәddis olmuşdur. Hәnәfi fәqihlәrindәn biridir. Mәşhur "әl-İbәnә әl-Kubra" kitabı ona aiddir. Hicri 387-ci ildә vәfat edib.
2. Әhmәd bin Kәmil bin Xalәf bin Şәcәrah әl-Qadi Әbu Bәkr; hicri 260-cı ildә doğulub vә hicri 350-ci ildә vәfat edib. Әhkam, Quran elmlәri, nәhv, şer vә tarix alimi olub vә bu fәnlәrdә kitablar yazıb.
3. Muhammәd bin Әhmәd bin İsmayıl әl-Bәğdәdi Әbul-Hüseyn bin Sәm'un; böyük imam vә vaiz sahibi idi. Hicri 387-ci ildә vәfat edib.

İbn Әbi Yalә - rahimәhullah – İbn Bәttah'dan belә dediyini nәql edir: "Hәcc zәvvarları tutulduqda әl-Bәrbәhәrini belә deyәrkәn eşitdim: "Ey insanlar! Әgәr yüz min dinar kömәk lazımdırsa – vә yüz min dinarı beş dәfә dedi – ona kömәk edәrәm." İbn Bәttah deyir: "Әgәr maddi dәstәk istәsәydi onu insanlardan әldә edәrdi."

İbn Әbi Yalә onun haqqında deyir: "Tayfanın[2] öz zamanındakı şeyxidir vә bidәti inkar etmәkdә, bidәt әhlinә qarşı әl vә dil ilә çıxmaqda onların içindә әn öndәri idi. Onun sultan yanında hörmәti var idi vә әshabımız yanında da yeri var idi. Arif imamlardan, üsul elmini gözәl bilәnlәrdәn, mötәbәr möminlәrdәn biri idi."

İbn Kәsir deyir: "Alim, zahid, hәnbәli fәqihi vә vaiz olmuşdur...bidәt vә günah әhlinә qarşı sәrt idi. Yüksәk hörmәtә sahib idi, ona hәr adlı-sanlı insanlar, hәm dә adi insanlar tәzim göstәrәrdi."

әz-Zәhәbi deyir: "Hәnbәlilәrin şeyxi, nümunә, imam... fәqih idi. Hәr zaman haqqı söylәyәrdi vә sünnәtә çağırardı. Allah uğrunda heç kәsin qınağından qorxmurdu."

İbn Әbi Yalә "әt-Tabәqat"da deyir: "әl-Bәrbәhәri'nin din uğrunda çoxlu çalışmaları vә mәqamları var idi. Müxaliflәr sultanın qәlbini ona qarşı sәrtlәşdirirdilәr. 321-ci ildә, әl-Qahir'in xilafәtindә vәziri İbn Muqlә onu hәbs etmәyә çalışdı, belәliklә o, gizlәndi. Onun әn böyük tәlәbәlәrindәn bir qrup kәs tutuldu vә Basra şәhәrinә aparıldı. Allah da İbn Muqlә'ni bu әmәlinә görә cәzalandırdı, belә ki, әl-Qahiri ona qarşı qәzәblәndirdi vә İbn

[2] Yәni hәnbәlilәrin

Muqlə qaçdı və əl-Qahir onu vəzirlikdən çıxardı və evi yandırıldı. 322-ci ilin cumədəl-axira ayının altısı çərşənbə günü əl-Qahir Billəh tutuldu, həbs olundu və vəzifəsindən endirildi. Həmin gün hər iki gözü də çıxarıldı, hətta hər ikisi də töküldü və kor oldu. Sonra Allahu Təalə lütfünü göstərdi və əl-Bərbəhəri bir daha öz hörmət və şərəf məqamına geri döndü. Üstəlik bu hörməti o qədər artdı ki, Niftaveyh adı ilə tanınan Əbu Abdilləh bin Arafə[3] öldükdə onun cənazəsində din və dünya adamlarının ən görkəmliləri iştirak edirdi və onların camaatlarında imamlıq üçün önə keçirilmiş kəs əl-Bərbəhəri idi. Bu, 323-cü ildə ər-Radi'nin xilafəti zamanında səfər ayında olmuşdu. Bu ildə əl-Bərbəhərinin hörməti daha da artdı, sözü yüksəklərə qalxdı və tələbələri üzə çıxdılar, çoxaldılar və bidətçiləri inkar etmək üçün ətrafa yayıldılar. Bizə çatan xəbərə görə əl-Bərbəhəri bir dəfə (Bağdad şəhərinin) qərb tərəfindən keçirdi. Birdən asqırdı və tələbələri "Allah sənə rəhm etsin!" dedilər. Səsləri o qədər ucadan çıxdı ki, xəlifə balkonunda durarkən eşitdi və nə baş verdiyini soruşdu. Ona xəbər verdilər və bu, onu qorxutdu. Bidətçilər hər zaman ər-Radi'nin qəlbində əl-Bərbəhəriyə qarşı nifrət oyatmağa çalışırdılar. ər-Radi polislərin böyüyü Bədr əl-Xarşəni'yə əmr edərək Bağdadın hər yerində belə elan edilməsini tələb etdi ki, əl-Bərbəhəri'nin tələbələrindən iki nəfər belə bir arada toplaşa bilməz. Bundan sonra əl-Bərbəhəri gizləndi, əvvəl qərb tərəfdə "Bəb Muhavval"da yaşayardı, sonra gizlənərək şərq tərəfə köçdü. 329-cu ilin rəcəb ayında gizli yaşadığı vəziyyətdə vəfat etdi.

Muhamməd bin Həsən əl-Muqri mənə rəvayət edərək dedi: babam və nənəm mənə rəvayət edərək dedilər: Əbu Muhamməd əl-Bərbəhəri şərq tərəfdə "Dərb əl-Həmməm"də, "Dərbus-Silsilə" küçəsində Tuzun'un bacısının evində gizlənmişdi. Orada təqribən bir ay qaldı. Sonra qan xəstəliyinə tutuldu. əl-Bərbəhəri onun yanında gizli yaşadığı halda ölərkən Tuzun'un[4] bacısı xidmətçisinə dedi: "Onu yuyacaq birini tap!" Yuyan biri gəldi və onu yudu və qapını bağladı ki, heç kəs bilməsin. Duraraq onun üçün tək cənazə namazı qıldı. Evin sahibi (Tuzunun bacısı) boylandı və evin üzərində ağ və yaşıl paltarlar olan kişilərlə dolu olduğunu gördü. (əl-Bərbəhərini yuyan şəxs) salamları verdikdə (Tuzunun bacısı evdə) heç

[3] O, İbrahim bin Muhamməd bin Arafə əl-Atəki'dir. Məşhur dil alimi və mühəddisdir. Zahiri məzhəbindən olub və Davud əz-Zahirinin özündən elm almışdır. əl-Hafiz əz-Zəhəbi'nin dediyinə əsasən zahirilərin rəyində avtoritet idi.

[4] Tuzun zamanındakı abbasi xəlifəsinin vəziri idi. Hicri 334-cü ildə vəfat edib.

kəsin olmadığını gördü və xidmətçisini çağırdı və dedi: “Ay Həccəm! Məni qardaşımın yanında həlak etdin!” Dedi: “Ey xanımım, mənim gördüyümü sən də gördünmü?” (Xanım) dedi: “Bəli!” Dedi: “Budur qapının açarları və qapı bağlıdır.” (Xanım) dedi: “Onu mənim evimdə dəfn edin və əgər mən ölsəm məni də onun yanında qübbə evində basdırın! Onu qadının evində basdırdılar və qadın ondan bir müddət sonra öldü və həmin yerdə basdırıldı. Üstündən zaman keçdi və türbəyə çevrildi və ora “əl-Məxarram”da “Darul-Məmləkə”nin yanındadır.[5]”[6]

İmam əl-Bərbəhəri hicri 329-cu ildə vəfat etmişdir.

---

[5] Bu hekayənin həqiqətini yalnız Allah bilir. Lakin belə bir imamın ölüsünü yumaq üçün heç bir kimsənin tapılmaması və ölüsü üzərində yalnız bir nəfərin cənazə qılması çox qəribədir. İşin həqiqətini Allah bilir.

[6] “Tabəqat əl-Hənəbilə”, 3/77-80

## Kitabın əlyazması

Kitabı təhqiq etmiş Şeyx əl-Cəmizi qeyd edir ki, kitabın təhqiqini yalnız bir əlyazma üzərində qurmuşdur. Başqa əlyazmaları tapmaq üçün çox səy göstərsə də buna nail ola bilməmişdir.

Təhqiqin əslini təşkil edən əlyazma Dəməşqdəki "Zahiriyyə" kitabxanasında (ümumi olaraq "90" nömrəsi altında) qorunulur. Bu əlyazmanın nüsxələri Mədinə İslam universitetində və onun kitabxanasında mövcuddur.

Əlyazma iyirmi səhifədən ibarətdir və hər səhifədə on beş sətr yer alır. Əlyazmanın birinci səhifəsində bu cür yazılıb:

"**Əbu Abdilləh Əhməd bin Muhamməd bin Ğalib əl-Bəhili Ğuləm Xalil'dən – rahiməhullah – "Şərhus-Sunnə" kitabı**

**Əbu Bəkr Əhməd bin Kəmil bin Xaləf bin Şəcərah əl-Qadinin rəvayəti**

**Əbu İshaq İbrahim bin Ömər bin Əhməd əl-Bərməki əl-Fəqihin icazə ilə Əbul-Həsən Muhamməd bin əl-Abbas bin Əhməd bin əl-Furat'dan, o da İbn Kəmil'dən rəvayəti.**

**Hörmətli, etibarlı Şeyx Əbu Talib Abdul-Qadir bin Muhamməd bin Abdil-Aziz bin Muhamməd bin Yusuf'un Əbu İshaq əl-Bərməki'dən, onun da icazə ilə İbnul-Furat'dan, o da icazə ilə ondan rəvayəti.**

**Hörmətli, etibarlı Şeyx Əbul-Hüseyn Abdul-Haqq bin Abdil-Xaliq bin Əhməd bin Abdil-Qadir bin Muhamməd bin Yusuf'un ondan eşidərək rəvayəti.**

**Ondan saleh imam Şeyx Əbul-Qasim Abdullah bin Həmzə bin Əbi Tahir bin Sənu eşitmişdir. Allah bununla onu və bütün müsəlmanları faydalandırsın!**"

İkinci vərəqdə isə bu sözləri keçir:

"**Şeyx, İmam Əbul-Hüseyn Abdul-Haqq bin Abdil-Xaliq bizə xəbər verdi: Ona dedilər: "Əbu Talib Abdul-Qadir bin Muhammməd bin Abdil-Qadir bin Muhammməd bin Yusuf "əl-Cami" məscidində sizə xəbər verdi və bu zaman həm o, həm də biz eşidirdik. Ona deyildi: Şeyx Əbu İshaq İbrahim bin Ömər bin Əhməd əl-Bərməki ondan rəvayət etməkdə sizə izn verdiyi və icazə verdiyində sizə xəbər etdi. O, bunu etiraf etdi və dedi: "Bəli!" Dedi: "Əbul-Hüseyn Muhammməd bin əl-Abbas bin Əhməd bin əl-Furat – rahiməhullah – kitabında xəbər verdi və onun kitabında oxunuldu: dedi: Əbu Bəkr Əhməd bin Kəmil bin Xaləf bin Şəcərah əl-Qadi ona oxumaq surətilə bizə xəbər verdi: dedi: "Əbu Abdilləh Əhməd bin Muhammməd bin Ğalib əl-Bəhili bu kitabı mənə verdi və mənə dedi: "Bu kitabı əvvəlindən axıra qədər mənim adımdan rəvayət et!"**

**Əbu Abdilləh Əhməd bin Muhammməd bin Ğalib əl-Bəhili – rahiməhullah – dedi:...**" və daha sonra kitabın içindəkiləri zikr edir.

Kitabın axırında isə bu sözlər yazılıb:

"**Kitabın axırıdır və aləmlərin Rəbbi Allaha həmd olsun və Muhammməd, onun ailəsinə salavat olsun! Bunu Abdullah bin Həmzə bin Sənu yazdı.**"

Kitabın əlyazması bir dənə olsa da bu kitabı İbn Əbi Yalə "Tabəqat əl-Hənəbilə" əsərində[7] müəllifin tərcümeyi-halında nəql etmişdir. İbn Əbi Yalənin nəql etdiyinin əvvəlindən bir vərəq çatışmır. Əlyazmadan fərqli olaraq isə İbn Əbi Yalənin nəqlinin axırında iki vərəq artıq gəlir. Şeyx əl-Cəmizi kitabın təhqiqi üçün İbn Əbi Yalənin nəqlini ikinci əlyazma kimi istifadə etmişdir. Bunun üçün "Tabəqat əl-Hənəbilə" kitabının Abdur-Rahmən bin Süleyman əl-Useymin tərəfindən edilmiş təhqiqinə əsaslanmışdır. Belə ki, o, "Tabəqatul-Hənəbilə" kitabının mövcud on

[7] "Tabəqat əl-Hənəbilə", 3/36-80

əlyazması içindən dördünü seçmişdir. Bu baxımdan onun təhqiqi Şeyx Muhamməd Həmid əl-Fiqi’nin – rahiməhullah – təhqiqindən daha dəqiqdir.

Şeyx əl-Cəmizi təhqiqində üstəlik Şeyx Əbul-Yəmən Mucirud-Din əl-Uleymi’nin “əl-Minhəcul-Əhməd fi Təracim Əshəbil-İməm Əhməd” kitabındakı nəqlindən də istifadə etmişdir. əl-Uleymi öz kitabında “Şərhus-Sunnə” kitabının təxminən dörddə birini nəql edir.

## Kitabın müəllifə nisbət edilməsinin doğruluğu

Əlyazma haqqında verilən məlumatlar içində əlyazmanın ilk səhifəsində yazılmış sözlər qeyd olundu və orada gördük ki, kitab əl-Bərbəhəriyə deyil, lakin Əbu Abdilləh Əhməd bin Muhamməd bin Ğalib əl-Bəhili Ğuləm əl-Xalilə nisbət edilir.

Bu məzmunun zahirindən anlaşılır ki, kitabı yazan Ğuləm Xalildir. Lakin kitabı rəvayət edən İbn Kəmil bunu aşkar şəkildə söyləmir, belə ki, o, deyir: "**Əbu Abdilləh Əhməd bin Muhamməd bin Ğalib əl-Bəhili bu kitabı mənə verdi və mənə dedi: "Bu kitabı əvvəlindən axıra qədər mənim adımdan rəvayət et!**"

Məhz bu səbəblə bəzi müasir əşarilər bu kitabın əl-Bərbəhəriyə deyil, Ğuləm əl-Xalilə aid olduğunu deyib. Onlar ortaya sual atırlar ki, əlimizdəki yeganə əlyazmada müəllifin adı Ğuləm Xalil olaraq zikr olunduğu halda nə üçün kitab əl-Bərbəhəriyə nisbət olunur? Üstəlik İmam Qavvamus-Sunnə Əbul-Qasim İsmayıl bin Muhamməd ət-Teymi əl-Əsbəhəni (vəfatı hicri 535) "əl-Huccə fi Bəyənil-Məhəccə" kitabında səhih etiqad haqqında kitab yazmış alimlərin adlarını sayarkən demişdir: "**Onlardan biri də Ğulam əl-Xalil adlı ilə tanınmış Əhməd bin Muhamməd bin Ğalibdir, Əhməd bin Hənbəlin tələbəsidir.**"[8] Lakin bu adların arasında İmam əl-Bərbəhərinin adını zikr etməmişdir. Müasirlərdən Doktor Fuat Sezgin "Tarix ət-Turas əl-Arabi"[9] kitabında Ğuləm əl-Xalil'in tərcümeyi halından danışarkən "əz-Zahiriyyə" kitabxanasındakı "Şərhus-Sunnə" əlyazmasını məhz ona aid etmişdir.

Bu iddianın sahibləri daha sonra Ğuləm Xalil'in hədis uydurmaqla ittiham olunduğuna işarə edərək kitabın dəyərini gözdən salmaq istəyirlər. Bunu isbat etmək üçün çox çalışıblar, lakin qarşıya qoyduqları sübutlar bizim

---

[8] "əl-Huccə fi Bəyənil-Məhəccə", 2/475
[9] "Tarix ət-Turas əl-Arabi", 3/231

burada qeyd etdiklərimizdən başqa bir şey deyildir. Bunu əsas tutaraq bu şübhələrə cavab verməyi uyğun görürük.

İlk olaraq onu qeyd edək ki, Ğuləm Xalil'in hədis uydurmaqla ittiham olunması doğrudur. əz-Zəhəbi onun haqqında deyilmiş bəzi sözləri nəql etmişdir : "İmam Əbu Bəkr əs-Sibği deyib: "Ğuləm Xalil yalan danışmasında şəkk etmədiyim kəslərdəndir." Əbu Davud əs-Sicistəni'dən onun belə dediyi rəvayət olunub: "O, Bağdadın dəccalıdır, onun mənə ərz olunmuş dörd yüz hədisinə baxdım və hamısının mətnləri də, sənədləri də yalandır." İbn Adiy deyir: "Əbu Abdilləh ən-Nuhəvandi'ni belə deyərkən eşitdim: "Bu hədislər barəsində Ğuləm Xalil ilə danışdım və dedi: "Bunları uydurduq ki, insanların qəlbləri düzəlsin."[10] Bəli, Ğuləm Xalil insanları xeyir əməllərə çağırmaq üçün hədis uydurmağı caiz görərmiş. Əlbəttə ki, bu şəkildə peyğəmbərin – salləllahu aleyhi va sələm – adından yalan danışmaq böyük və ağır bir günahdır.

Əgər biz kitabın Ğuləm Xalilə aid olduğunu qəbul etsək bu, yenə də kitabın dəyərinə xələl gətirməz, çünki Guləm Xalil hədis uydurmaqla ittiham olunsa da əqidəsi səhih bir alim olmuşdur, öz zamanında hörmət edilmiş bir imam idi. Daha əvvəl İmam Qavvamus-Sunnə'nin onu səhih etiqad haqqında əsər yazmış imamlar arasında zikr edən sözlərini nəql etdik. Əslində bu, onların bizə qarşı dəlili idi, lakin həqiqətdə Qavvamus-Sunnə'nin sözləri onların özlərinə qarşı dəlildir. Həmçinin İmam əz-Zəhəbi onun tərcümeyi-halına başlayarkən deyir: "Şeyx, alim, zahid, vaiz, Bağdadın şeyxi Əbu Abdilləh Əhməd bin Muhamməd bin Ğalib bin Xalid bin Mirdəs əl-Bəhili əl-Basri Ğuləm Xalil. Bağdadda yaşayıb. Onun çox qeyri-adi böyüklüyü, hörməti var idi, heybətli xarizması var idi. Həmişə yaxşılıqları əmr etmək işi ilə məşğul idi, (sünnətə) çox tabe idi, səhih etiqada sahib idi, lakin açıq şəkildə yalan rəvayət edərdi və hədis uydurmağı caiz görərdi. Allahdan salamatçılıq diləyirik."[11] Həm İmam Qavvamus-Sunnə əl-Əsbəhəni, həm də İmam əz-Zəhəbi Ğuləm Xalilin etiqadının səhih olduğunu deyiblər.

Lakin bununla belə bu kitabı Ğuləm Xalilə nisbət etmək böyük bir xətadır. Bu barədə gətirilmiş şübhələrə cavab vermək çox asandır.

---

[10] "Siyər Əaləm ən-Nubələ", 13/283-284
[11] "Siyər Əaləm ən-Nubələ", 13/282-283

Hər şeydən əvvəl qeyd etməliyik ki, bu kitabı İmam əl-Bərbəhəriyə nisbət edənlər ümmətin ən böyük alimləri və imamlarıdır. Onların bəzilərinin adlarını burada qeyd edirik. İlk olaraq bu kitabı əl-Bərbəhəriyə nisbət edən böyük hənbəli alimi İbn Əbi Yalə (vəfatı hicri 526) olmuşdur və daha əvvəl də qeyd etdiyimiz kimi "ət-Tabəqat" kitabında cüzi bir hissəsi istisna olmaqla kitabın tamamını nəql etmişdir. İbn Əbi Yalə isə hənbəli alimləri və onların kitabları haqqında mütəxəssis bir alim olmuşdur, buna görə də "Tabəqatul-Hənəbilə" kitabını qələmə almışdır. əl-Bərbəhəri'dən etdiyi bir çox rəvayətində onunla arasında yalnız iki nəfər vasitəçi olur. Bu isə onun əl-Bərbəhəriyə nə qədər yaxın olduğunu göstərir.

Həmçinin Şeyxul-İslam İbn Teymiyyə'nin - rahiməhullah – babası Məcdud-Din İbn Teymiyyə "əl-Musvaddə" kitabında bu kitabı əl-Bərbəhəri'yə nisbət etmişdir. Onun nəvəsi Şeyxul-İslam isə "Buğyətul-Murtəd" kitabında bunu ona nisbət edir.

Bu kitabı həmçinin əz-Zəhəbi bir çox kitabında, İbn Abdil-Hədi əl-Hənbəli, İbn Muflih əl-Hənbəli "əl-Furu" və "əl-Ədəb" kitabında, əs-Safədi "əl-Vafi bil-Vafiyət"də, İbnul-Ğazi "Divanul-İsləm" kitabında, İbn Racəb əl-Hənbəli, İbn Həcər əl-Asqaləni "Fəthul-Bari"də, İbnul-İməd əl-Hənbəli "əş-Şəzərat" kitabında, İbnun-Nəccar əl-Fətuhi "Şərh əl-Kəukəb əl-Munir"də, əl-Mərdəvi "ət-Təhbir Şərhut-Təhrir"də, "Əbul-Yəmən əl-Uleymi "əl-Minhəc əl-Əhməd" kitabında ona nisbət ediblər.

Bu iddia sahibləri İbn Əbi Yalə'nin xəta etdiyini, digər bütün alimlərin də xətasında ona tabe olduqlarını deməyə cürət ediblər. İbn Əbi Yalə'nin xəta etməsi mümkündür, lakin digər alimlərdən heç kimsənin bu xətanı tapa bilməməsi, əksinə eyni xətanı təkrarlaması çox uzaq bir ehtimaldır.

Onu da qeyd etməliyik ki, İbn Əbi Yalə'nin əlyazması kitabı Ğuləm Xalilə nisbət edən əlyazmadan fərqlənir, hətta axırında iki vərəq artıqdır. Bu onu göstərir ki, İbn Əbi Yalə'nin istifadə etdiyi əlyazma kitabı əl-Bərbəhəriyə nisbət edib. Həmçinin əl-Uleymi'nin gətirdiyi nəql bəzi yerlərdə İbn Əbi Yalə'nin nəqlindən fərqlənir, lakin həmin yerlərdə əlimizdə mövcud olan əlyazmaya müvafiqdir. Bu da onu göstərir ki, bizim zamanımıza gəlib çatmış əlyazmada xəta vardır və bu, xətanın ravilərdən birinə, yoxsa əlyazmanı köçürənlərdən birinə aid olduğunu demək çətindir.

Bu kitabın Ğuləm Xalilə aid olmadığını dəstəkləyən məqamlardan biri də budur ki, kitabın içində uydurma hər hansı bir rəvayət yoxdur. Məlum oldu ki, Ğuləm Xalil insanların qəlblərini qorxu və məhəbbət ilə doldurmaq üçün hədis uydurmağı caiz görərdi. Bu kitab da insanlara xitab olaraq yazıldığı üçün kitabın içində bu şəkildə uydurma rəvayətlərin olması daha münasib olardı. Lakin bunların olmaması bir daha şahidlik edir ki, kitab Ğuləm Xalil tərəfindən yazılmayıb.

İmam Qavvamus-Sunnə'nin isə Ğuləm Xalili səhih etiqad izhar etmiş imamlar arasında zikr etməsi, lakin əl-Bərbəhərini zikr etməməsi heç bir şey ifadə etmir, çünki Ğuləm Xalil'in də səhih etiqad haqqında sözləri ola bilər. Qavvamus-Sunnə orada etiqad haqqında kitab yazmış digər imamların da adlarını zikr etməmişdir. Misal üçün Əbu Bəkr bin Əbi Davud, İbn Cərir ət-Tabəri, Əbul-Hüseyn əl-Acurri və daha başqa imamların adlarını zikr etməmişdir.

Doktor Fuat Sezginin bu əlyazmanı Ğuləm Xalilə aid etməsi da özlüyündə heç bir sübut deyildir, çünki əlyazmanın üzərindəki nisbətin xəta olması çox aşkardır. Fuat Sezginin bu nisbətə əsaslanması da onun qədər aşkardır.

Xülasə olaraq bu kitabın İmam Əbu Muhamməd əl-Bərbəhəri'yə aid olduğunu söyləyirik və buna kölgə salmaq üçün önə sürülən şübhələrin güclü dəyərə sahib olmadığını vurğulayırıq.

## (Şərhus-Sunnə kitabının əvvəli)

İslamı tapmaqla bizə hidayət verən, onunla bizi nemətləndirən və bizi ən xeyirli ümmət kimi çıxaran Allaha həmd olsun! Sevdiyi və razı olduğu işlərə bizi müvəffəq etməsini və sevmədiyi, qəzəbinə səbəb olduğu işlərdən bizi qorumasını Ondan diləyirik.

**[1]** Bilin ki, İslam sünnətin özüdür və sünnət də elə İslamın özüdür[12], onlardan biri digəri olmadan mövcud ola bilməz.

**[2]** Sünnətə aid olan şeylərdən biri də həmişə camaatla birlikdə olmaqdır. Hər kim camaatdan qaçarsa[13], ondan ayrılarsa İslam boyunduruğunu boynundan atmış olur[14] və yolunu azan və yoldan azdıran birinə çevrilmiş olur.

**[3]** Üzərində camaatın qurulduğu əsas Muhammədin – salləllahu aleyhi va səlləm – səhabələridir. Allah onlara rəhm etsin! Sünnət və Camaat əhli onlardır. Onlardan götürməyən yolunu azmış və yenilik (bidət) gətirmişdir. Hər bir bidət isə zəlalətdir. Zəlalət və onun əhli atəşdədir. Ömər bin əl-Xattab – rahiməhullah – dedi: "Hidayət olduğunu güman edərək zəlalət yolunu getməkdə, nə də zəlalət olduğunu zənn edib hidayəti tərk etməkdə heç kəsin üzrü yoxdur. Çünki hər bir məsələ izah olunub, hüccət də isbat edilib və üzr kəsilib."[15] Bunun izahı budur ki, sünnət və camaat artıq dinin bütün məsələlərini möhkəmləndiriblər və insanlar üçün (hər şey) aydındır və insanlara qalan tabe olmaqdır.

---

12 Müəllif özü bu sözləri kitabın axırında Bişr bin əl-Harisin sözləri olaraq nəql etmişdir.
13 Raddadi'nin təhqiqindəkinə əsasən: "hər kim camaatdan başqa bir şey istəyərsə..."
14 İmam Əhməd (5/180) Əbu Zərdən rəvayət edir ki, peyğəmbər – salləllahu aleyhi va səlləm – deyib: "Kim camaatdan bir qarış belə ayrılsa artıq İslam boyunduruğunu boynundan atmışdır."
15 Bunu Ömər bin Şəbbə "Əxbərul-Mədinə" kitabında (2/12) və İbn Battah "əl-İbənə əl-Kubra"da (rəq: 162) əl-Əvzai vasitəsilə Ömər bin əl-Xattab'dan rəvayət edirlər. Ömər bin əl-Xattab ilə əl-Əvzai arasındakı sənəd qopuqdur.

**[4]** Bil ki, - Allah sənə rəhm etsin! – din Allah - Təbərakə va Təalə - tərəfindən gəlib, insanların ağılları və fikirlərinə əsasən qurulmayıb. Onun elmi Allahın yanındadır, Onun elçisinin yanındadır. Öz nəfsi istəyinə uyub bir şeyə tabe olma ki, dindən qopmayasan və İslamdan çıxmayasan. Çünki sənin heç bir üzrün yoxdur, belə ki, Allahın elçisi – salləllahu aleyhi va səlləm – ümmətinə sünnəti bəyan edib və onu səhabələrinə izah edib və camaat onlardır. əs-Səvad əl-Azam[16] onlar sayılır. əs-Səvad əl-Azam isə haqq və onun əhlidir. Dini işlərdən hər hansı birində Allah elçisinin – salləllahu aleyhi va səlləm – səhabələrinə müxalif olan küfr etmişdir.

**[5]** Bil ki, insanlar hər dəfə bir bidət çıxardıqda onun eyni bərabərində bir sünnəti tərk ediblər. Sonradan uydurulmuş işlərdən çəkin, çünki hər sonradan çıxarılmış iş bidətdir və hər bidət zəlalətdir. Zəlalət və onun əhli isə atəşdədir.

**[6]** Kiçik bidətlərdən də çəkin! Çünki kiçik bidət böyüyərək böyük bidətə çevrilir. Bu ümmətdə ortaya çıxarılmış hər bidət də bunun kimidir; ilk əvvəldə kiçik bidət olaraq başlamış, haqqa bənzəmişdir və bu bidətə daxil olan da buna görə aldandı, sonra artıq oradan çıxa bilmədi. Beləliklə də (bidət) böyüyərək tabe olunan bir dinə çevrildi. Beləliklə (həmin bidətçi isə) doğru yola müxalif oldu və bununla da İslamdan çıxdı.

**[7]** Bax! Allah sənə rəhm etsin! Hər hansı bir kəsin, aləlxüsus zamanının insanlarından bir kəsin söylədiyi sözü eşitdikdə peyğəmbərin – salləllahu aleyhi va səlləm – səhabələrindən kiminsə və ya alimlərdən kiminsə bu sözü deyib demədiyini soruşmadan, araşdırmadan tələsmə, ondan hər hansı bir şeyə daxil olma![17] Əgər bu barədə onlardan bir rəvayət tapsan ona

---

[16] Hərfi mənada böyük çoxunluq anlamına gələn "əs-səvad əl-azam" termini haqqında alimlərin görüşü fərqlənib. Lakin onlar xüsusilə qeyd edirlər ki, bu, adi insanların çoxluğuna aid deyildir. Müəllifin görüşü isə budur ki, hədisdə zikr olunan "əs-səvad əl-azam" səhabələrə aiddir.

[17] Bu, şazz və nadir görüşlərə tabe olmağın caiz olmaması anlamına gəlir. Ona görə də müsəlman bir zatın hər hansı bir görüşün sələfdən qaynaqlanıb qaynaqlanmadığına baxması lazımdır. Zamanımızda şazz görüşlər ayaq tutub gəzdiyi bir halda bunun əhəmiyyəti xüsusilə nəzərə çarpır. Onu da bilmək lazımdır ki, şazz görüşlər böyük alimlərdən də sadir ola bilər, əgər o alimdən əvvəl heç kim o görüşdə olmayıbsa onun sözü qəbul olunmamalıdır.

möhkəm sarıl![18] Cəhənnəmə düşməmək üçün başqa bir şeyin xatirinə onun üzərindən keçmə və başqa şeyi ona üstün tutma!

**[8]** Bil ki, (haqq) yoldan kənara çıxmaq iki cür olur: birincisinə gəldikdə bir nəfər yalnız xeyir məqsəd güddüyü halda xəta edərək yoldan ayrılır, bu halda onun xətasını izləmək olmaz, çünki o, həlak olmuşdur. Digər bir nəfər isə haqqa qarşı inad edir, özündən əvvəlki təqva əhlinə müxalif olur, belə biri yolunu azmış və insanları azdıran biridir, bu ümmətdəki üsyankar bir şeytandır, onu tanıyanların insanları ondan çəkindirməsinə və onun halını bəyan etməsinə layiqdir ki, onun bidətinə düşərək heç kəs həlak olmasın![19]

**[9]** Bil ki, - Allah sənə rəhm etsin! – qul tabe olmadıqca, təsdiq etmədikcə və təslim olmadıqca onun islamı səhih olmaz. Kim İslamın məsələləri içindən peyğəmbərin – salləllahu aleyhi va səlləm – səhabələrinin bizə çatdırmadıqları bir məsələnin qaldığını iddia edərsə, onları yalanlamış olur və onun bu sözü onlara qarşı bir tənədir. Belə bir kəs bidətçidir, yolunu azmış və başqalarını azdıran biridir. İslamda olmayan bir şeyi uydurmuş biridir.

[18] Səhabələrin müctəhidləri öz aralarında bir çox məsələdə ixtilaf ediblər. Cahil birinə onlardan hər hansı birinə bu ictihadlarında tabe olmaq dini üçün ən salamat yoldur. Səhabələrin ixtilafları isə məzhəblərin ixtilaflarında öz əksini tapır. Ona görə də böyük imamlar qəbul etdikləri görüşləri üçün səhabələrin görüşlərini misal gətiriblər və belə olduğu halda onlardan birini təqlid etmək elmsiz müsəlmanlar üçün caizdir.

[19] Yəni onu və onun zəlalətini tanıyanlar insanları ondan xəbərdar etməlidirlər ki, digərləri aldanaraq onun tələsinə düşməsinlər.

## (Kəlam elmi və Allahın sifətləri)

**[10]** Bil ki, - Allah sənə rəhm etsin! – sünnətdə qiyas[20] yoxdur və ona bənzərlər, misallar gətirməzlər. Sünnətdə nəfsi istəklərə tabe olunmaz. O, necəliyini soruşmadan, şərhini vermədən Allah elçisinin – salləllahu aleyhi va sələm - əsərlərini təsdiq etməkdir. “Nə üçün?” və “necə?” sualları soruşulmaz!

**[11]** Kəlam elmi[21], polemikalar, münaqəşə və mübahisələr sonradan uydurulmuş işlərdir ki, sahibi haqqa və sünnətə müvafiq olsa belə qəlbində şəkk doğurur.

**[12]** Bil ki, - Allah sənə rəhm etsin! – Allah haqqında kəlam (elmi) sonradan uydurulub. O, bir bidət və zəlalətdir. Allah haqqında yalnız Onun Quranda Özünü vəsf etdiyi şeylərlə və peyğəmbərinin – salləllahu aleyhi va sələm – səhabələrinə bəyan etdiyi şeylərlə danışmaq olar. O, - cəllə sənəuhu – Təkdir,

“**Onun heç bir bənzəri yoxdur. O, Eşidəndir, Görəndir.**”[22]

Rəbbimiz zamansız əvvəldir, sonu olmadan ən axırıncıdır. Hər bir sirri və sirdən də gizli olanı bilir. Ərşin[23] üzərinə qalxmışdır[24] və Onun elmi hər yerdədir[25]. Onun elmindən heç bir yer xali deyildir.

---

[20] Buradakı qiyas ilə fasid olan analoji əqli düşüncə qəsd olunur, çox vaxt şəriətin hökmləri öz nəfslərinə uyğun gəlmədiyi üçün insanlar bu cür fasid qiyasa baş vururlar. Bu isə İblisin atəş ilə torpaq arasında qiyas etməsinə bənzəyir, özünün atəşdən, Adəmin isə torpaqdan yaradıldığını göstərərək ona səcdə etməməyin doğru olduğunu isbat etmək istəyirdi. Ona görə də sünnətdə qiyas yoxdur, sünnətin açıq-aşkar hökmünə tabe olmaq lazımdır.

[21] Kəlam elmi mötəzili alimlərinin mülhidlərə cavab vermək məqsədilə onların fəlsəfələrindən yararlanaraq qurduqları bir elmdir ki, həqiqətdə Qurana və sünnətə əsaslanmır. Lakin mülhidlərə onların öz fəlsəfələri ilə cavab vermək istəyən mötəzilə nəticədə İslamın bir çox sabit hökmlərini kəlam elminin gərəyi olaraq tərk etdilər.

[22] əş-Şura, 11

[23] Ərş sözünün ərəb dilində bir neçə mənası vardır. Ərş kralların, məliklərin taxtına deyilir. Allahu Təalə Hudhud quşunun Səba əhlinin məlikəsi Bilqis haqqında belə dediyini bizə xatırladır: "Mən onlara padşahlıq edən bir qadın gördüm. Ona hər şey verilmişdir. Onun çox böyük bir taxtı vardır." (ən-Nəml, 23) Evin ərşi deyildikdə isə evin tavanı, damı mənasını verir. Ərşin bir başqa mənası rükun, sütun deməkdir. Ərşin dördüncü mənası mülk mənasıdır. Beşinci məna bir nəfərin halının, işinin izzətli, güclü olmasına həmin adamın ərşi deyilib, bu güclülük və izzət əldən gedəndə ərşi yıxıldı deyərlər. Ərşin digər mənaları da vardır. Lakin Allahın Ərşi deyildikdə zahiri mənası birinci mənadır. əl-Hafiz əl-Beyhəqi "əl-İtiqad val-Hidəyətu ilə Səbilir=Raşəd" kitabında (səh: 116) deyir: "Ərş əql sahiblərinə görə hamının bildiyi taxtdır." Sələfin bu görüşünə küllabilər, kərramilər, ilk dövr əşarilər və bəzi cəhmilər ilə mötəzili alimləri müvafiq olublar.

[24] Bil ki, ümmətin ilk imamları Allahın zatı ilə Ərşin üzərinə qalxmasına (istiva etməsinə) iman ediblər. Onlar bu barədə gələn ayələri və hədisləri təsdiqləyiblər və onlara iman gətiriblər. İlk dövr hənbəli alimlərində bu barədə heç bir ixtilaf olmamışdır. Lakin onlar bunun sifəti haqqında təfsilatda ixtilaf ediblər. Hənbəli alimlərindən Əbul-Həsən Abdul-Aziz bin əl-Haris ət-Təmimi buradakı istivanın nə Ərşə toxunmaq, nə də ondan ayrı olmaq mənasına gəlmədiyini demişdir. Bu, həm də əl-Qadi Əbu Yalə'nin "Muxtəsar əl-Mutəməd fi Usulid-Din" kitabında qəbul etdiyi görüşdür. Digər böyük hənbəli alimi, əl-Qadi Əbu Yalənin şeyxi, öz zamanındakı hənbəlilərin imamı Əbu Abdilləh əl-Həsən bin Həmid əl-Bəğdədi isə istivanın Ərşə toxunmaq və onun üzərində oturmaq anlamına gəldiyini deyib. Bu, həm də Abdul-Vahhab bin əl-Həkəm əl-Varraq'ın görüşüdür ki, İmam Əhməd bu zat haqqında demişdir: "O, bir imamdır." Bu görüş isə ayədəki "istiva" sözündən çıxarılan mənalarla bağlıdır. İbn Həmid'ə görə oturmaq "istiva" sözünün tələb etdiyi mənalardandır. İmam Əhmədin oğlu Abdullah "əs-Sünnə" kitabında (1/300-302) "Kürsi və Allahın – Azzə va Cəllə - onun üzərində oturması haqqında soruşuldu" adlı bir bab açmışdır və orada deyir: "Atamın – Allah ona rəhmət etsin! – bu hədisləri və (Axirətdə Allahı) görmək haqqındakı hədisləri səhih saydığını və ona əsaslandığını gördüm, onları bir kitabda topladı və bizə rəvayət etdi." İmamın oğlu Abdullah daha sonra bu rəvayətləri zikr edir: "Atam – Allah ona rəhmət etsin! – mənə rəvayət edərək dedi: Abdur-Rahmən (bin Mehdi) bizə Sufyan (əs-Səvri)'dən, o da Əbu İshaq'dan, o isə Abdullah bin Xalifə'dən, o da Ömərdən – radiyallahu anhu – belə dediyini rəvayət edir: "(Allah) Təbərakə va Təalə Kürsiyə oturanda ondan yeni yəhərin cırıltısı kimi bir cırıltı səsi gəlir." Bu hədisi İmam İbn Cərir ət-Təbəri öz təfsirində peyğəmbərdən – salləllahu aleyhi va səlləm – mərfu olaraq rəvayət etmişdir. Abdullah bin Xalifə'nin Həzrəti Ömərdən hədis eşidib eşitməməsi haqqında şübhələr olduğu üçün hədisin səhihliyi sual altındadır. əl-Hafiz İbn Kəsir təfsirində (1/681) bu əsər haqqında danışarkən onu rəvayət edən Abdullah bin Xalifə haqqında deyir: "Belə məşhur deyildir və Ömərdən (hədis) eşitməsində şübhə vardır." Lakin əvvəlki zamanın böyük imamları bu hədisləri qəbul ediblər və inkar etməyiblər. İmamımızın oğlu Abdullahın rəvayət etdiyi bu əsər də onu dəstəkləməkdədir: "Atam mənə rəvayət etdi: (İmam əş-Şafi'nin şeyxi) Vaki (bin əl-Cərrah) bizə İsrailin Əbu İshaq'dan, onun da Abdullah bin Xalifə'dən, onun isə Ömərdən – radiyallahu anhu – belə deməsi haqqındakı hədisi rəvayət etdi: "Rəbb – Azzə va Cəllə - Kürsiyə oturanda..." və Vaki'nin məslisində (bu hədisi eşidəndə) bir nəfərin – atam onun adını çəkmişdi – əti ürpəşdi (yəni nəfsi bunu xoş görmədi) və Vaki qəzəbləndi və dedi: "əl-Aməş və Sufyan'la qarşılaşdıq; bu hədisləri rəvayət edərdilər və onları inkar etməzdilər." Gördüyümüz kimi əl-Aməş, Sufyan, Vaki, İmam Əhməd kimi böyük imamlar bu hədisi qəbul ediblər və mənasını təsdiqləyiblər. Şeyxul-İslam İbn Teymiyyə -

rahiməhullah – deyir: “Bunların arasında Abdullah bin Xalifə’nin məşhur hədisi vardır, hansı ki, Ömərdən, o da peyğəmbərdən – salləllahu aleyhi va səlləm – rəvayət edir. Bunu Əbu Abdilləh Muhamməd bin Abdil-Vahid əl-Məqdisi “əl-Muxtəra” kitabında rəvayət etmişdir. Hədis əhlindən bir qrup (bu hədisi) iztirabına görə rədd ediblər, necə ki, bunu Əbu Bəkr əl-İsmaili, İbnul-Cəvzi və başqaları ediblər, lakin əhli-sünnətin əksəriyyəti onu qəbul edib.” (“Məcmu əl-Fətəva”, 16/435) Hədisdəki iztirab ilə qəsd olunan bəzən mərfu olaraq, bəzən məvquf olaraq, bəzən də mürsəl olaraq rəvayət edilməsidir. Həmçinin “Minhəcus-Sunnətin-Nəbəviyyə” kitabında (2/629) deyir: “əl-İsmaili və İbnul-Cəvzi kimi birdən çox mühəddis bu hədisi zəif sayıb, lakin alimlərdən bunun üçün şahidlər zikr edən və (hədisi) gücləndirənlər vardır.” əl-Hafiz İbnul-Qayyim – rahiməhullah – “Təhzib əs-Sünən” (4/2173-2174) kitabında bu hədisin mərfu şəklini dəlil gətirərək onu zəif sayanların sözlərini rədd etmişdir. Xülasə Allahu Təalənin Ərşin üzərində oturması sifətini inkar etmək caiz deyildir və bu barədə İmam Şəmsud-Din əz-Zəhəbinin sözlərini nəql etməkdə fayda vardır. əz-Zəhəbi bu hədisi “Kitəbul-Arş”da (səh: 49-50) zikr edərək deyir: “Bu, öz vaxtında kufəlilərin imamı Əbu İshaq əs-Səbii’nin hədisindən məhfuz olan bir hədisdir. Əbu İshaq səhabələrdən bir çoxundan hədis eşitmiş və (əl-Buxari ilə Muslim) onun hədisini “əs-Səhiheyn”də rəvayət ediblər. (Hicri) yüz iyirmi yeddinci ildə vəfat edib. Bu hədisi ən əvvəlki tabiindən olan Abdullah bin Xəlifə’dən tək olaraq rəvayət etmişdir. (Abdullah bin Xalifə’nin) cərh və tədil baxımından halını bilmirik, lakin Əbu İshaq əs-Səbii digər sifət hədisləri kimi bu hədisi təsdiq edərək rəvayət edib. Bunu həmçinin Sufyan əs-Səvri rəvayət edib, Əbu Əhməd əz-Zubeyri, Yəhya bin Əbi Bukeyr və Vaki bunu İsmail’dən rəvayət edib.” əz-Zəhəbu bu sözlərindən sonra İmam Əhmədin oğlu Abdullahın yuxarıda rəvayət etdiyimiz iki rəvayətini zikr edir və deyir: “Deyirəm: Bu hədis bir qrup mühəddisə görə səhihdir. Bunu əl-Hafiz Diyaud-Din əl-Məqdisi “əs-Səhih” kitabında rəvayət edib. Bu, həm də İbn Hibban’ın şərtinə uyğundur, lakin rəvayət edib etmədiyini bilmirəm, çünki ona görə adil və hafiz biri cərh edildiyi bilinməyən bir nəfərdən rəvayət edərsə, bu isnad səhihdir. Əgər bu imamlar: Əbu İshaq əs-Səbii, əs-Səvri, əl-Aməş, İsrail, Abdur-Rahmən bin Mehdi, Əbu Əhməd əz-Zubeyri, Vaki, Əhməd bin Hənbəl və saymaqla adları və ədədləri bitməyən, hidayət işıqları və zülmətləri işıqlandıran misbəhlər olan bu və digər imamlar bu hədisi qəbul ediblərsə, onu rəvayət ediblərsə, onu inkar etməyiblərsə və isnadına tənə etməyiblərsə biz kimik ki, onu inkar edək və onlara kəm baxaq? Əksinə buna iman edirik və (həqiqi) elmini Allaha – Azzə və Cəllə - tapşırırıq.”

Alləmə İbn Həmid’in istivanı toxunmaq kimi təfsir etməsi isə xətadır və sələfin görüşünü tam haqqı ilə təmsil etmir. Eynilə Əbul-Həsən ət-Təmimi’nin bunun Ərşdən ayrı olmaq mənasını inkar etməsi də doğru deyildir, bu görüşlər sadəcə onların bəzi rəvayətlərdən anladıqları mənanı təmsil edir. Halbuki əhli-sünnətin böyük imamları və alimləri Allahın Ərşin üzərinə qalxdığını, yüksəldiyini və oturduğunu deməklə bərabər Onun Öz yaratdıqlarından ayrı olduğunu da vurğulayıblar və Ərş Allahın məxluqlarından bir məxluqdur. Şeyxul-İslam İbn Teymiyyə “Nəqd Təsis əl-Cəhmiyyə”də (2/531) deyir: “Allahın Ərşin üzərində və yaratdıqlarından ayrı olması barədə sələfin icmasını və ya əhli-sünnətin icmasını və ya səhabə və tabiinin icmasını nəql edənlərin sayını Allahdan başqa heç kim saya bilməz... Sələfin alimləri həmişə (Allahın yaratdıqlarından) ayrı olmasını isbat ediblər və cəhmiyyənin bunu inkar etməsini rədd ediblər.” Bu görüşü İbnul-Qayyim İmam Əhməddən nəql etmişdir. Bu, bir daha isbat edir ki, sələfin Allahın isim və sifətlərini zahiri mənalarına uyğun olaraq qəbul etmələri və iman etmələri təcsim və təşbih deyildir.

**[13]** Allaha şəkk edəndən başqa heç kəs Allahın sifətləri haqqında "necə?" və "nə üçün?" suallarını soruşmur.

**[14]** Quran Allahın kəlamıdır[26], Onun endirdiyidir və Onun nurudur. Yaradılmamışdır, çünki Quran Allahdandır və Allahdan olan bir şey yaradılmış deyildir. Malik bin Ənəs, Əhməd bin Hənbəl və bu ikisindən əvvəl və sonra yaşamış fəqihlər eynilə bu şəkildə deyiblər. Bunda mübahisə etmək küfrdür.

---

25 Bu, cəhmiyyənin görüşünü inkar edir, çünki onlara görə Allahu Təalə zatı ilə hər yerdədir, lakin əhli-sünnət etiqad edir ki, Allahu Təalə zatı ilə Ərşin üzərindədir və elmi ilə hər yeri bürümüşdür.

26 Əhli-sünnət Quranın Allahın Kəlamı olduğuna etiqad edirlər və digər firqələr bu məsələdə əhli-sünnətə müxalif olublar. Zahirdə Quranın Allahın Kəlamı olduğunu deyən əşarilər və maturidilər həqiqətdə əlimizdəki Quranın məxluq olduğuna etiqad edirlər. Bu isə əşariliyin və maturidiliyin əslində sünnilik olmadığını isbat edir.

## (Səhih sünnətdə gələn xəbərlərə iman etmək)

**[15]** Qiyamət günü (Allahı) görməyə iman etmək[27]. Başlarındakı gözlər vasitəsilə Allahı görəcəklər və O, arada bir pərdə və ya bir tərcüməçi olmadan onları hesaba çəkəcək.

**[16]** Qiyamət günündə tərəziyə iman etmək[28]. Orada hər bir xeyir və hər bir şərr ölçüləcək. Onun iki gözü və bir dili vardır.

**[17]** Qəbir əzabına, Münkir ilə Nəkirə iman etmək[29].

---

[27] əl-Hafiz İbn Hacər "Fəthul-Bari bi Şərh Sahih əl-Buxari" kitabında (17/448) deyir: "Allahu Təalənin axirətdə görünməsi haqqında varid olmuş hədislərin rəvayət kanallarını əd-Dəraqutni bir araya toplayıb və sayı iyirmidən çox olub. İbnul-Qayyim "Hədi əl-Ərvah" kitabında bu hədisləri axtarmış və otuza çatmışdır və onların çoxu ceyyiddir. əd-Dəraqutni sənədi ilə Yəhya bin Main'dən onun belə dediyini rəvayət edir: "Məndə (Allahı) görmək barədə on yeddi səhih hədis vardır." əl-Hafiz İbnul-Qayyim – rahmətullahi aleyhi – bu hədislərin mütəvatir olduğunu deyir. Mötəzilə firqəsi Allahı Axirətdə belə görməyin mümkün olacağını inkar ediblər. Onlara görə Allah cism deyildir və cism olmayan bir şey hər hansı bir cihətdə, istiqamətdə mövcud deyildir və əgər bir şey bir cihətdə, bir istiqamətdə mövcud deyildirsə onu görmək olmaz. Bu isə mötəzili alimlərinin bu cür ilahi məsələlərdə əqlin qoyduğu qaydalara etibar etmələrindən irəli gəlir, halbuki insan əqli Allahı dərk edə bilməz. Əşarilər isə bu məsələdə bir-birinə zidd iki etiqadı birləşdirməyə çalışıblar, belə ki, onlar mötəzilə ilə razılaşaraq Allahın cims olmadığını və hər hansı bir cihətdə olmadığını deyiblər, lakin mötəzilədən fərqli olaraq göz ilə görmək üçün cihətin lazım olmadığını deyiblər. Buna görə də məşhur filosof İbn Rüşd əl-Həfid onların bu etiqadlarını lağa qoyaraq bunun saçmalıq olduğunu göstərmişdir. Şeyxul-İslam İbn Teymiyyə - rahiməhullah – İbn Rüşdün özünün də əqidəsinin batil olduğunu, onun əqidəsinin zındıqlıq olduğunu qeyd etdikdən sonra əşarilərə verdiyi rəddiyənin yerində olduğuna diqqət çəkmişdir. Ona görə də sələf cihəti inkar etməyiblər, sadəcə olaraq şəriətin gətirdiyi xəbərləri təsdiqləməklə kifayətləniblər. Biz də etiqad edirik ki, Allahu Təalə axirət günü həqiqi gözlərimizlə görüləcəkdir.

[28] əl-Hafiz İbn Hacər "Fəthul-Bari"də (17/628) deyir: "Əbu İshaq əz-Zəccac dedi: "Tərəziyə, Qiyamət günündə qulların əməllərinin çəkiləcəyinə, tərəzinin iki gözünün və bir dilinin olmasına və əməllərə görə əyildiyinə iman etmək üzərində əhli-sünnət icma edib."

**[18]** Allah elçisinin – salləllahu aleyhi va səlləm – hovuzuna iman etmək[30]. Saleh peyğəmbərdən başqa – aleyhissələm - bütün peyğəmbərlərin hovuzu vardır, Salehin hovuzu isə dişi dəvəsinin əmcəyidir[31].[32]

**[19]** Qiyamətdə, Sirat körpüsündə günahkarlara, xətakarlara peyğəmbərin – salləllahu aleyhi va səlləm – şəfaət etməsinə iman etmək (haqdır). Onları cəhənnəmin ən içindən çıxaracaq. Hər bir peyğəmbərin şəfaət haqqı vardır, eynilə siddiqlərin, şəhidlərin və salehlərin də şəfaət haqqı var. Bundan sonra Allahın dilədiyi kəslərə çoxlu mərhəmət, iltifat edəcək. Yanaraq kömür olduqdan sonra atəşdən çıxmaq (haqdır).

**[20]** Cəhənnəmin üzərindəki Sirat körpüsünə iman etmək. Sirat körpüsü Allahın dilədiklərini götürəcək. Allahın dilədikləri keçəcəklər və Allahın dilədikləri cəhənnəmə düşəcək. Körpünü keçənlərin imanları miqdarında nurları olacaq.

---

[29] Qəbir əzabı haqqındakı hədislər məna baxımından mütəvatir hədislərdir. Əşari alimi əl-Kəməl bin Əbi Şərif "əl-Musəmərə bi Şərhil-Musəyərə" kitabında (səh: 228) deyir: "[Qəbir əzabı, onun nemətləri haqqında xəbərlər varid olub], yəni sorğu-sual və qəbir əzabı və onun nemətləri haqqında müxtəlif ləfzlərlə (varid olub) və [rəvayət kanalları çoxdur], o qədər çoxdur ki, hər biri ayrılıqda mütəvatir dərəcəsinə çatmasa da hamısı birlikdə məna etibarı ilə mütəvatirlik ifadə edir." İshaq bin İbrahim bin Hani ən-Neysəburi İmam Əhmədə verilmiş suallar haqqında topladığı "Məsəil İmam Əhməd" adlı kitabında (2/156; sual: 1879) deyir: "Dedi: "Bəs qəbir əzabı və Munkir ilə Nəkir?" Əbu Abdilləh dedi: "Bunların hamısına iman edirik və bunlardan birini kim inkar edərsə o, cəhmidir." Məlumdur ki, İmam Əhməd cəhmiləri kafir sayardı. Nəql olunduğu kimi qəbir əzabını xavariclər və bağdadlı mötəzili alimləri inkar ediblər. Alimlərin çoxuna görə qəbir əzabını inkar edən kafir sayılmaz, lakin bidətçidir.

[30] Hovuz haqqındakı hədislər mütəvatir dərəcəsinə çatmışdır və onu otuzdan çox səhabə rəvayət edib. Bunlardan bir çoxu əl-Buxari'nin və Muslim "əs-Səhih" kitablarındadır.

[31] Yəni digər peyğəmbərlər qövmləri ilə birlikdə öz hovuzlarından su içəcəkləri halda Saleh peyğəmbər öz qövmü ilə birlikdə dişi dəvəsinin əmcəyindən süd içəcək.

[32] Bu barədə bəzi hədislər gəlib ki, heç biri səhih deyildir. Əksinə İbnul-Cəvzi, əz-Zəhəbi, İbn Hacər kimi alimlər bu hədisləri uydurma sayıblar. Bu hədisi əl-Uqeyli "əd-Duafə əl-Kəbir"də (3/64) və onun vasitəsilə İbnul-Cəvzi "əl-Məuduat"da (2/417) Abdul-Kərim bin Keysən yolu ilə rəvayət edib. İbnul-Cəvzi deyir: "Uydurma bir hədisdir, bir əsli yoxdur. əl-Uqeyli deyir: "Abdul-Kərim nəql etməkdə məchuldur və hədisi məhfuz deyildir." Hədisin məhfuz olmaması onun münkər olması anlamına gəlir. əz-Zəhəbi "əl-Mizən" kitabında (2/645) onun tərcümeyi-halında deyir: "Məchullardan biridir və hədisi münkərdir..." və daha sonra bu hədisini zikr edir və arxasınca deyir: "Bu, uydurmadır. Doğrusunu Allah bilir!" İbn Hacər "Lisənul-Mizən"də (4/52) hədis haqqında deyir: "O, uydurmadır."
Bu rəvayəti həmçinin Həmid bin Zəncəveyh və onun vasitəsilə İbn Asəkir tarix kitabında (10/458) başqa bir yolla Kəsir bin Murra'dan mürsəl olaraq rəvayət edib.

**[21]** Peyğəmbərlərə və mələklərə iman gətirmək.

**[22]** Cənnətin haqq olmasına və cəhənnəmin haqq olmasına iman etmək. Cənnət və cəhənnəm iki məxluqdur.[33] Cənnət göyün yeddinci qatındadır[34] və tavanı Ərşdir. Atəş isə Yerin yeddinci, ən aşağı qatının altındadır.[35] Bunların hər ikisi də yaradılmışdır. Allah Cənnət əhlinin, ora daxil olanların sayını və Cəhənnəm əhlinin, ora daxil olanların sayını bilir. Hər ikisi də heç bir zaman sona varmayacaq. (Cənnət və cəhənnəm) Allahın - Təbarakə və Təalə - qalması ilə əbədilərdən əbədi, sonsuz bir zamanda qalacaq. Adəm də yaradılmış və qalıcı olan cənnətdə idi[36] və Allaha asi olduqdan sonra oradan çıxarıldı.

---

[33] Əhli-Sünnətin etiqadı budur ki, Cənnət və Cəhənnəm indi mövcuddurlar və insanlar üçün hazır haldadırlar. Bunu yalnız mötəzili və qədəri alimləri inkar ediblər, onlara görə Cənnət və Cəhənnəm Qiyamət günündə yaradılacaqlar.

[34] Cənnətin səmanın yeddinci qatında olması əhli-sünnətin məşhur görüşüdür. Lakin zahirilərdən İbn Həzm Cənnətin səmanın altıncı qatında olduğunu söyləmişdir ki, buna əhəmiyyət verilməz. Kəlam əhlindən ət-Təftəzani və ona tabe olan bəzi əşari alimləri bu məsələdə doğru olanın bunun elmini Allaha həvalə etmək olduğunu deyiblər. Lakin əhli-sünnətin görüşü müəllifin söylədiyi görüşdür və Quran və sünnətə əsaslanır.

[35] Əbuş-Şeyx "əl-Azamə" (3/1102) kitabında Əbu Za'ra vasitəsilə Abdullah bin Məsud'dan belə dediyini rəvayət edir: "Cənnət ən yuxarıda yeddinci səmadadır, atəş isə ən aşağıda yeddinci yerdədir." Əbu Za'ra'nın adı Abdullah bin Həni'dir. əl-Buxari onun haqqında "ət-Tarix əl-Kəbir"də (5/221) deyir: "Onun rəvayət etdiyini başqaları rəvayət etmir." əl-Hafiz İbn Hacər "ət-Təqrib"də (3701) deyir: "əl-İcli onu siqa saymışdır." əl-Hafiz İbn Rəcəb "ət-Təxvif minən-Nər" kitabında (səh: 63) deyir: "İbn Əbid-Dunyə isnadı ilə Qatədə'dən belə dediyini rəvayət edir: "Onlar (yəni səhabələr) belə deyərdilər: "Cənnət göyün yeddinci qatındadır və cəhənnəm isə yerin yeddinci qatındadır." Şeyx Ömər əl-Əşqar "əl-Cənnətu van-Nər" adlı kitabında (səh: 21) deyir: "Cəhənnəmin indiki yeri haqqında alimlər ixtilaf ediblər; bəziləri dedi: o, yerin ən alt qatındadır. Başqaları isə dedi: O, səmadadır. Digərləri isə bu məsələdə təvəqquf etdilər, durdular, bir görüş bildirmədilər və doğru olan da budur, çünki onun yerini müəyyən edən səhih və açıq mənalı bir dəlil yoxdur. Bu məsələdə təvəqquf edənlərdən biri əl-Hafiz əs-Suyuti'dir. Dedi: "Cənnət haqqında dur! Yəni onun haqqında bir görüşdə olmadığını söylə, yəni onun yeri haqqında, Allahdan başqa heç kəsin bilmədiyi bir yerdədir və mənə görə (bunda) əsaslana biləcəyim bir hədis belə sabit deyildir." Şeyx Valiyullah əd-Dəhləvi əqidə kitabında deyir: "Şəriətin mənası açıq dəlilləri bu ikisinin (yəni cənnət və cəhənnəmin) yeri haqqında bir şeyi aşkar şəkildə deməyib. Əksinə Allahu Təalənin istədiyi yerdədir və bizim Allahın yaratdıqları və aləmləri haqqında elmimiz yoxdur." Siddiq Həsən Xan (kitabında) əd-Dəhləvi'nin bu sözlərini gətirdikdən sonra deyir: "Deyirəm: Bu görüş görüşlər içində - inşallah - ən üstün və ən ehtiyatlı görüşdür." Bu sözləri Siddiq Həsən Xan "Yəqzatu Ulil-İtibər" kitabında (səh: 48) deyir.

[36] Adəm – aleyhissələm – indi mövcud olan, qalıcı olan, Allahın saleh bəndələri üçün hazırlanmış Cənnətdə idi, yoxsa onun olduğu cənnət başqa bir cənnət idi? Müəllif əl-Bərbəhəri birinci görüşü zikr etmişdir və bu, əhli-sünnətin məşhur görüşüdür. Şeyxul-

**[23]** Yalançı Məsihə[37] və İsa ibn Məryəmin nazil olacağına iman etmək. Enəcək, Dəccalı öldürəcək və evlənəcək[38] və Muhamədin – salləllahu aleyhi va sələm – ailəsindən çıxacaq şəxsin arxasında namaz qılacaq. Öləcək və müsəlmanlar onu dəfn edəcəklər.

---

İslam İbn Teymiyyə'nin bu məsələdə iki görüşü vardır. Birinci görüşündə bunun qəti olaraq salehlər üçün hazırlanmış qalıcı və əbədi cənnət olduğunu deyir və bunun əksini deyənlərin filosoflar və mötəzilədən olan kəlam əhli olduğunu deyir. Lakin başqa bir kitabında məhz ikinci görüşün səhih olduğunu demişdir. əl-Hafiz İbnul-Qayyim – rahiməhullah – "Hadi əl-Ərvah" və "Miftəh Daris-Səadə" kitablarında görüşləri dəlilləri ilə birlikdə zikr etmişdir. Fəxrud-Din ər-Razi isə bu məsələdə təvəqquf edib.

[37] Yalançı Məsih namazda dualarımızda Məsih əd-Dəccal deyərək zikr etdiyimiz şəxsdir və onun haqqında gəlmiş hədislər mütəvatirdir. Bu hədislərin səhihliyində şəkk edənlərin sözlərinə əhəmiyyət verilməz. Məşhur hənbəli alimi Alləmə əs-Səffərini "Ləvamiul-Ənvar əl-Bəhiyyə" kitabında (2/106) zikr etdiyi əhəmiyyətli qeydlər içində bunu da qeyd edir: "Üçüncü tənbeh: Hər bir alimə dəccal haqqındakı hədisləri övladlar, qadınlar və kişilər arasında yaymaq lazımdır. İmam İbn Macə demişdir: "ət-Tanəfisi'ni belə deyərkən eşitdim: əl-Muhəribi'ni belə deyərkən eşitdim: "Bu hədisin – yəni dəccal haqqındakı hədisin – müəllimlərə verilməsi lazımdır ki, onları dərslərdə uşaqlara öyrətsinlər."

[38] Bu barədə səhih bir şey bilmirik. Nueym bin Həmməd "əl-Fitən" kitabında (2/578; rəqəm: 1616) Yəhya bin Səid əl-Attar'dan, o da Suleyman bin Musa'dan belə dediyini rəvayət edir: "Mənə çatıb ki, İsa ibn Məryəm Dəccalı öldürdükdən sonra Qüdsə geri dönəcək və Musa peyğəmbərin zövcəsinin qohumlarından, Şueybin qövmündən evlənəcək, uşağı olacaq və on doqquz il qalacaq. Nə əmir, nə polis, nə də kral olacaq." "ət-Təqrib" kitabında (7608) deyildiyi kimi Yəhya bin Səid əl-Attar zəifdir. Süleyman bin Musa isə əl-Siczi'dir. Əbu Hatim və əl-Cəuzəcəni onun haqqında deyiblər: "Yalançıdır." Bax: "Mizənul-İtidəl", (3/308) Bütün bunlarla birlikdə bunun tam bir sənədi yoxdur. İbnul-Cəvzi "əl-İləl əl-Mutənəhiyə" kitabında (2/915; rəqəm 1529) Abdur-Rahmən bin Ziyad bin Ənam vasitəsilə Abdullah bin Yezid əl-Hubuli'dən, o da Abdullah bin Ömər'dən belə dediyini rəvayət edir: "Allahın elçisi – salləllahu aleyhi va sələm – dedi: "İsa ibn Məryəm yer üzünə nazil olacaq, evlənəcək və uşağı olacaq, qırx beş il yaşayıb öləcək. Mənimlə qəbrimdə dəfn olunacaq. Əbu Bəkr ilə Ömərin arasından mən və İsa ibn Məryəm bir qəbirdən çıxacağıq." İbnul-Cəvzi bu hədisin arxasından dedi: "Bu hədis səhih deyildir, əl-İfriqi tamamilə zəifdir." əz-Zəhəbi "Mizənul-İtidəl" kitabında (4/281) Abdur-Rahmən bin Ziyad əl-İfriqi'nin tərcümeyi-halında bu və digər hədisləri rəvayət etdikdən sonra deyir: "Bunlar münkərdir, (doğru olmaqları) möhtəməl deyildir."

## (İman söz və əməldir)

**[24]** İmanın söz və əməl olmasına, əməl və söz olmasına, niyyət və isabət[39] olmasına iman etmək. İman artır və azalır. Allahın dilədiyi qədər arta bilər və heç bir şey qalmayana qədər azala bilər.[40]

---

[39] Yəni sünnətə müvafiq olması

[40] Əhli-sünnətin etiqadına görə əməl imanın bir hissəsidir, əməlsiz iman olmaz. Bu məsələdə əhli-sünnət alimlərindən əl-Hafiz İbn Abdil-Bərr və İbn Cərir ət-Təbəri kimi bəzi böyük imamlar fərqli düşünüblər. Onlara görə qulun əməlləri tamamilə tərk etməsi onun qəlbindəki imanını aradan qaldırmır. Bu, həm də əşarilərin və maturudilərin görüşüdür. Şeyxul-İslam İbn Teymiyyə bir çox yerdə bu görüşləri rədd etmiş və əhli-sünnətin səhih görüşünü açıq-aşkar dəlillərlə izah etmişdir. İbn Teymiyyə "Məcmu əl-Fətəva"da (7/616) deyir: "Daha əvvəl dediyimiz kimi əməlin cinsi qəlbdəki imanın (qaçınılmaz) tələblərindəndir və zahiri əməllərdən bir şey olmadan qəlbdəki səhih imanın olması imkansızdır." Şeyxul-İslamın işlətdiyi "əməlin cinsi" sözü məsələni ən gözəl izah edən termindir, çünki əhli-sünnət hansı əməlin tərkinin qəlbdəki imanı aradan qaldırması haqqında ixtilaf ediblər. Bəzilərinə görə bu, namaz, oruc, zəkat və həcdir, digərlərinə görə bu, yalnız namazdır, imamların və alimlərin çoxu isə hər hansı bir əməlin təklikdə tərkinin imanı aradan qaldırmadığını deyiblər. Lakin ilk dövr əhli-sünnət imamları əməlin özünü tamamilə tərk etməyin, yəni zahirdə Allah rızası üçün heç bir əməl etməməyin insanın qəlbindəki imanı yox edəcəyini deyiblər, çünki onlara görə zahir ilə batin bir-birindən ayrılmayacaq dərəcədə möhkəm bağlıdır. Ona görə də bunun üçün Şeyxul-İslam qısa olaraq "əməlin cinsi" terminini işlətmişdir. Sələfdən bir çox zatın sözü bunu təsdiq edir. İbn Əbi Şeybə "Kitəbul-İman"da (səh: 49, rəqəm: 136) Ömərin azadlı qulu Zeyd bin Əsləm'in belə dediyini rəvayət edir: "Bu dinin əhlində bu dörd şeyin olması qaçınılmazdır/labüddür: İslam çağırışına daxil olmaq və Allaha, birincisindən tutmuş axırıncısına qədər elçilərinin hamısına, Cənnət ilə Cəhənnəmə və ölümdən sonra dirilişə iman etmək və onları təsdiq etmək labüddür və imanını təsdiq edəcək hər hansı bir əməli etmən labüddür və əməlini gözəl/doğru edən bir elm öyrənmən də labüddür. Sonra bu ayəni oxudu: "Şübhəsiz ki, Mən həm də tövbə edib iman gətirəni, yaxşı işlər görüb sonra da doğru yolu tutanı çox bağışlayanam!" (Taha, 82)" Bu kitabı təhqiq edən Şeyx əl-Albani – rahiməhullah – isnadının səhih olduğunu deyir. İmam əl-Hafiz Əbul-Qasim Hibətullah İbnul-Həsən bin Mənsur ət-Təbəri əl-Laləkai əş-Şafii – rahmətullahi aleyhi – məşhur və mübarək "Şərh Usuli İtiqadi Əhlis-Sunnəti val-Cəməə" kitabında (2/931) deyir: "əl-Valid bin Muslim dedi: "əl-Əvzəi, Malik bin Ənəs və Səid bin Abdil-Aziz'i "iman əməlsiz sözdür" deyənlərin bu sözlərini inkar edərkən eşitdim və deyərdilər: Əməlsiz iman yoxdur və imansız da əməl yoxdur." Yenə eyni kitabda (səh: 932-933) İmam Əbu Səvrin belə dediyini nəql edir: "Əməlin imandan olmadığını iddia

edən tayfaya gəldikdə isə onlar belə deyirik: Allah – Azzə va Cəllə - qullarına “Namaz qılın və zəkat verin” deyəndə onlardan nə istədi? Bunu iqrar etmələrini? Yoxsa həm iqrar, həm də əməl etmələrini? Əgər desələr ki, Allah iqrar etmələrini istəmiş, əməl etmələrini istəməmişdir, o zaman küfr edərlər, (çünki) elm əhlinə görə “şübhəsiz ki, Allah qullarından namaz qılmalarını, zəkat verməlerini istəməmişdir” deyən kəs (küfr etmişdir.) Əgər desələr ki, onlardan həm iqrar, həm də əməl istəmişdir. Onda deyərik: Onlardan hər iki işi birlikdə istəyibsə o zaman nə üçün iddia edirsiz ki, bu ikisindən biri olmadan digərini etməklə mömin olur? Halbuki onların hər ikisini də istəmişdir. Tutaq ki, bir adam “Allahın əmr etdiyi hər şeyi edirəm, lakin onları iqrar etmirəm” deyərsə, nə düşünürsüz? Belə biri mömin olurmu? Əgər “yox” desələr onlara deyərik: “Allahın əmr etdiyi hər bir şeyi iqrar edirəm, lakin onlardan heç bir şeyə əməl etmirəm” deyərsə necə? Mömin olurmu? Əgər “bəli” desələr onlara deyərik: Fərq nədir? Özünüz də dediniz ki, Allah (ayədə) bu işin hər ikisini də qəsd etmişdir. Onda bu işlərdən birini etməklə, digərini tərk etməklə mömin ola bilirsə, o zaman gərək o birisi ilə də, iqrar etmədən əməl etməklə də mömin olsun. Bunların arasında bir fərq yoxdur. Əgər dəlil gətirib desələr ki, “əgər bir nəfər müsəlman olarsa, sonra peyğəmbərin – salləllahu aleyhi va səlləm – gətirdiyi hər bir şeyi iqrar edərsə, əməl etmə vaxtı gəlmədən öncə bu iqrar ilə mömin olurmu? Ona deyərik: Biz yalnız vaxtı gələndə əməl edəcəyini deyərək əməlin ona vacib olmasını təsdiq etməsi ilə ona iman ismini veririk və onun üzərinə həmin vaxtda mömin olması üçün lazım olan hər şeyi təsdiq etməsi vacib deyildir. Əgər “iqrar edirəm, lakin əməl etmirəm” deyərsə ona iman adını verməritk.” İmam Əbu Səvrin sözləri burada bitir. Bu görüş sələfin məşhur görüşüdür. Hətta bu fərzləri təsdiq etməklə birlikdə tərk edənləri təkfir etməyənləri bəzi imamlar mürciə adlandırıblar və onların görüşlərinin küfr olduğunu deyiblər. Alləmə İbn Rəcəb “Fəthul-Bari”də (1/22) namazı tərk edənin kafir olması görüşünün hədis əhlindən çox alimə aid olduğunu dedikdən sonra deyir: “İshaq bin Rahəveyh bunu onlardan icma olaraq nəql etmiş, hətta “(İslamın) bu rükunlarını təsdiq etməklə birlikdə onları tərk edənlər kafir olmurlar” deyənlərin görüşünü mürciələrin görüşündən saymışdır. Sufyan bin Uyeynə də bu cür demişdir: “Mürciələr fərzləri tərk etməyi haramları etmək səviyyəsində bir günah sayırlar. Bu ikisi eyni deyildir, çünki halal görmədən qəsdən bu haramları etmək günahdır, lakin heç bir cahillik və üzr olmadan fərzləri tərk etmək isə küfrdür...Hərb isə İshaq’dan belə dediyini nəql edir: “Mürciələr ifrata vardılar, hətta görüşlərindən biri də bu oldu: (Onlardan) bir qrup deyir: “Hər kim vacib buyurulmuş namazları, ramazan orucunu, zəkatı, həcci və bütün fərzləri onları inkar etmədən tərk edərsə, biz onu təkfir etmirik, sonra onun halı Allaha ümid edilir, çünki o, təsdiq edir.” Bunlarda – yəni onların mürciə olmasında – heç bir şəkk yoxdur.” Bunun eynisini əl-Laləkai kitabında (3/957) İmam əl-Humeydi’dən nəql edir: “Hənbəl bin İshaq deyir: əl-Humeydi bizə xəbər verdi: Mənə xəbər verdilər ki, bir qrup insan deyir: “Hər kim namazı, zəkatı, orucu və həcci təsdiq edərsə və ölənə qədər bunlardan heç bir şey etməzsə və ya ölənə qədər arxası qibləyə tərəf namaz qılarsa, tərk etdiyinin onun dinində olduğunu bilərsə, fərzləri və qibləyə tərəf yönəlməyi təsdiq edərsə belə biri bunları inkar etmədiyi müddətdə mömindir.” Dedim ki, bu, açıq-aşkar küfrdür, Allahın Kitabına, elçisinin – salləllahu aleyhi va səlləm – sünnətinə və müsəlmanların əməlinə müxalifdir...” Bütün bunlar bu görüşlərin ilk dövr imamlar tərəfindən necə şiddətlə inkar edildiyini göstərir. Məşhur hənbəli alimi İmam İbn Battah əl-Ukbəri (vəfatı hicri 387) “əl-İbanə” kitabında (2/760-761) deyir: “Bilin ki, - Allah sizə rəhm etsin! – tərifi sonsuz, isimləri müqəddəs olan Allah Onu tanımağı, Onu, elçilərini, kitablarını, sünnətin gətirdiyi hər bir şeyi təsdiq etməyi qəlbə, bunu nitq etməyi, söyləməklə təsdiq etməyi dilə və əmr etdiyi, əməllərdən fərz buyurduğu hər şeylə əməl

etməyi bədənlərə və əzalara fərz buyurmuşdur; bunlardan biri digəri olmadan keçərli sayılmır. Qul bunların hamısını bir arada cəm etmədikcə, qəlbində iman etmədikcə, dilində təsdiq etmədikcə və səy göstərib əzaları ilə əməl etmədikcə iman gətirmiş olmaz." İbnul-Hənbəli adı ilə tanınmış digər böyük hənbəli alimi Şeyx Abdul-Vahhəb bin Abdil-Vahid bin Muhammədbin Əli əl-Ənsari əş-Şirazi (vəfatı hicri 536) "ər-Risələtul-Vadihə fir-Raddi aləl-Əşaira" kitabında (2/802-804) deyir: "İmanın söz və əməl olmasına həmçinin dəlalət edən Allahu Təalənin bu sözləridir: "Gözəl söz Ona tərəf qalxır və saleh əməl onu qaldırır". (Fatir, 10) Allahu Təalə xəbər verir ki, söz yalnız əməl ilə qaldırılır, çünki onu qaldıran əməldir, bu isə dəlalət edir ki, əməl ilə müşaiyət edilməyən söz qaldırılmır. Zikri uca olan Allah deyir: "İman edib yaxşı işlər görənlərin mənzili isə Firdovs cənnətləri olacaq!" (əl-Kəhf, 107) Beləliklə də xəbər verir ki, hər kim sözünü əməl ilə müşaiyət etmir onun cənnətdə heç bir payı yoxdur. Allah – Azzə va Cəllə - deyir: "Şübhəsiz ki, Mən həm də tövbə edib iman gətirəni, yaxşı işlər görüb sonra da doğru yolu tutanı çox bağışlayanam!" Beləliklə Allahu Təalə xəbər verir ki, O, yalnız sözü ilə əməli bir yerdə cəm edənləri bağışlayır və bu ikisindən biri digəri olmadan heç bir fayda vermir. Allah – Azzə va Cəllə - deyir: "İman edib yaxşı əməllər edənlər isə yaradılmışların ən xeyirliləridir." (əl-Beyyinə, 7) Bununla da imanı söz və əməl olması ilə və sözsüz əməlin fayda vermədiyi kimi əməlsiz də sözün fayda verməməsi ilə vəsf etmişdir." Sözsüz ki, səhabələrə nəzər salsaq onların namazı tərk edəni kafir saydıqlarını görəcəyik. Tabiinlər arasında da bu görüş məşhur görüşdür, hətta demək olar ki, əz-Zuhri'dən başqa heç kəs fərqli düşünməyib. İlk dövr hədis imamları arasında da bu görüş məşhur olub. Lakin ixtilaf daha sonra məşhurlaşdı. Namazı tərk edənin kafir olmadığını deyən imamlar belə ümumən əməlsiz imanın olmadığını təsdiq edirlər. Əhli-sünnətin imamı Muhamməd bin İdris əş-Şafi – radiyallahu anhu – bu barədə icma nəql edir. Şafii alimi İmam Hibətullah əl-Laləkai yenə eyni kitabında (3/956-957) deyir: "əş-Şafi – rahiməhullah – "əl-Umm" kitabında, namazda niyyət babında dedi: Namazın niyyətsiz keçərli olmaması barəsində Ömər bin əl-Xattab'ın peyğəmbərdən – salləllahu aleyhi va sələm – (rəvayət etdiyi) hədisini dəlil kimi göstəririk: "Əməllər yalnız niyyətlərinə görədir." Sonra dedi: "Səhabələrin və onlardan sonra gələn tabiinlərin, onlardan qarşılaşdıqlarımızın icması vardır ki, iman söz, əməl və niyyətdir və bu üçündən biri digəri olmadan keçərli deyildir." Müasirlərdən bəziləri buna cavab olaraq deyirlər ki, əlimizdə nəşr olunmuş "əl-Umm" kitabında bu sözlər yoxdur. Biz isə deyirik ki, bunu sözündə etibarlı olan, hicri 418-ci ildə vəfat etmiş Əbul-Qasim Hibətullah kimi bir imam deyir. Yenə "əl-Umm" kitabından bunu Şeyxul-İslam İbn Teymiyyə nəql edir. Üstəlik şafii alimi əl-Fəxr ər-Razi əşari olduğu üçün əş-Şafi'nin bu sözlərini təzadlı, ziddiyətli saymış və sözlərin problemli olduğunu etiraf etmişdir ki, bunu ondan Şeyxul-İslam nəql edir. Bunu həmçinin İbnut-Tilmisəni, Bədrud-Din əz-Zərkəşi və İbn Hacər əl-Heytəmi də zikr ediblər və əl-Heytəminin "əl-İləm bi Qavati'il-İsləm" kitabında zikr etdiyi kimi İbnut-Tilmisəniyə görə əş-Şafinin sözünün gərəyi əməlləri olmayanın iman dairəsindən çıxmasıdır. əl-Heytəmi isə buna etiraz edərək insanı cəhənnəmdən qurtaran imanın qəlbdəki təsdiq və dildəki şəhadət olduğunu deyir. Bu isə zikr etdiyimiz kimi əşarilərin görüşüdür. İndiki zamanımızda kitabın çap olunmuş şəklində bu sözlərin olmaması həqiqətən olmamasını sübut etmir. Bizə sözlərinə etibar etdiyimiz alimlərin şahidliyi kifayət edir. Üstəlik əməlsiz də imanın mövcud olacağını deyənlərə bildirmək istəyirik ki, sizin bu etiqadınıza əsasən həqiqi iman qəlbdə və dildə olan imandır. Çünki həqiqi iman möminə fayda verən imandır. O zaman sizin əməlləri də iman adlandırmağınız irca əhli ilə ixtilafınızın yalnız ləfzdə olduğunu göstərir.

## (Səhabələrin fəziləti)

**[25]** Peyğəmbərimizin vəfatından sonra bu ümmətin ən xeyirlisi Əbu Bəkr, Ömər və Osmandır.[41] İbn Ömərdən bizə bu şəkildə rəvayət edilib; dedi: "Allahın elçisi – salləllahu aleyhi va səlləm – bizim aramızda olduğu zaman deyərdik: Allahın Elçisindən – salləllahu aleyhi va səlləm – sonra insanların ən xeyirlisi Əbu Bəkr, Ömər və Osmandır. Peyğəmbər də - salləllahu aleyhi va səlləm – bunu eşidərdi və inkar etməzdi."[42]

Bunlardan sonra insanların ən xeyirlisi Əli, Talha, əz-Zubeyr, Sa'd, Sa'id, Abdur-Rahmən bin Auf, Əbu Ubeydə bin əl-Cərrahdır. Onların hamısı xəlifəliyə layiqdir.

---

[41] Əhli-sünnət, xavaric, mötəzilə və kəlam əhlinin hamısı Əbu Bəkr və Ömərin səhabələr içində ən fəzilətli olmasında icma ediblər. Həttə ilk dövr şiələr belə bunu qəbul edirdilər. Bu ikisindən sonra ən fəzilətli kimin olması barədə ixtilaf edilib. Əhli-sünnətin əksəriyyəti, İmam əş-Şafi, İmam Əhməd və dörd məzhəbin əshabı, kərramiyə, kulləbiyyə, əşariyyə və mötəzilədən olan kəlam əhlinin əksəriyyəti Osmanın üçüncü gəldiyinə etiqad edirlər. Bu, həm də İmam Malikin məşhur görüşüdür. Kufə əhlinin çoxundan isə Əlinin fəzilətdə Osmandan üstün olması görüşü nəql olunub. Bunların arasında Sufyan əs-Səvri və Əbu Hənifə də yer alır. Bunların sonradan bu görüşlərindən döndükləri də nəql olunmuşdur. Eynilə bir qrup alim isə bu ikisi arasında hansının daha fəzilətli olmasında təvəqquf edib. Bu, Sufyan'dan rəvayət edilib. Bu, həm də İmam Malikdən gələn rəvayətdir. Yəhya əl-Qattan və Yəhya bin Main bu görüşdə olublar. Osmanın fəzilətdə Əlidən üstün olması səhabələrin görüşüdür və müəllifin İbn Ömərin hədisindən rəvayət etdiyi bunun dəlilidir. Digər bir dəlil isə Ömərin ölümündən sonra xəlifə təyin etmək üçün toplaşmış şurada yalnız Osman və Əli qalmışdı və Abdur-Rahmən bin Auf onların arasında seçim etmək üçün üç gün, üç gecə mühacirlər, ənsarlar, möminlərin anaları ilə müşavirə etdi və sonunda Osmanın daha layiq olduğuna qərar verdi. Bir nəfər Abdullah bin əl-Mubarək'dən bu iki zatdan hansının daha fəzilətli olması barədə soruşduqda belə cavab verdi: "Abdur-Rahmən bin Auf bizə bunun cavabını verdi." (əl-Xalləl, "əs-Sunnə", 2/389)

[42] əl-Buxari (3655, 3698) azca fərqli ləfzlə rəvayət edib, lakin orada peyğəmbərin – salləllahu aleyhi va səlləm – bunu inkar etməməsi sözləri yoxdur. Bu sözlər İbn Əbi Asim'in "əs-Sünnə" kitabında (1193) rəvayət etdiyi xəbərdə keçir və onu Şeyx əl-Albani "Ziləlul-Cənnə"də səhih saymışdır.

Bunlardan sonra isə insanların ən xeyirlisi peyğəmbərin – salləllahu aleyhi va səlləm – səhabələridir, (peyğəmbərin) aralarında göndərildiyi ilk nəsildir: ilk mühacirlər ilə ənsarlardır və onlar iki qibləyə[43] namaz qılmış səhabələrdir.

Bunlardan sonra insanların ən xeyirlisi peyğəmbərə - salləllahu aleyhi va səlləm – bir gün, bir ay və ya bir il, az və ya çox səhabəlik etmiş kəsdir. Ona rəhmət oxu, onun fəzilətini zikr et və onun xətaları barədə sus! Onlardan heç bir kəsin xeyrindən başqa bir şeyini zikr etmirik, çünki Allahın elçisi – salləllahu aleyhi va səlləm – deyib: "Səhabələrimin adı çəkiləndə durun!"[44] İbn Uyeynə deyir: "Kim peyğəmbərin – salləllahu aleyhi va səlləm – səhabələri haqqında tək bir söz belə söyləsə o, hava əhlidir[45]."

Peyğəmbər – salləllahu aleyhi va səlləm – dedi: "Səhabələrim ulduzlar kimidir, onlardan kimin yolunu izləsəniz hidayət taparsız."[46]

---

[43] Həm Qüdsə tərəf, həm də Kəbəyə tərəf

[44] Bu hədisi səhabələrdən İbn Məsud, Səubən, İbn Ömər rəvayət edir. Bunu ət-Tabərani "əl-Mucəm əl-Kəbir"də (10/198), əl-Haris bin Əbi Usamə "əl-Müsnəd"də (2/748) və Əbu Nueym "əl-Hilyə"də (4/108) rəvayət edir. əl-Hafiz İbn Hacər "Fəthul-Bari"də (11/477) bunun həsən olduğunu deyir.

[45] Yəni öz nəfsi istəklərinə tabe olan biridir. Hava əhli alimlərin sözlərində bidət əhli üçün işlədilən sözdür.

[46] Bunu əl-Hafiz İbn Abdil-Bərr "Cəmiu Bəyanil-İlmi va Fədlihi" kitabında (2/925; rəqəm 1760) Cabir bin Abdilləh'dən rəvayət edir. Səhabələrdən başqa kəslər də bunu rəvayət ediblər, lakin hədis imamları bu rəvayəti inkar ediblər. İbn Qudamə "əl-Muntəxab min əl-İləli lil-Xalləl" adlı kitabında (səh: 143) deyir: "Musa bin Səhl mənə xəbər verdi: Muhamməd bin Əhməd əl-Əsədi bizə rəvayət etdi: İbrahim bin Yaqub bizə İsmail bin Said'dən belə dediyini rəvayət etdi: "(İmam) Əhməddən peyğəmbərin – salləllahu aleyhi va səlləm – "səhabələrim ulduzlar kimidir, hansını izləsəniz hidayət taparsız" sözlərini dəlil gətirənlər haqqında soruşdum. Dedi: "Bu hədis səhih deyildir." Bu hədisi əl-Bəzzar, İbn Adiy, əd-Dəraqutni, əl-Beyhəqi, İbn Abdil-Bərr, İbn Asəkir, İbnul-Cəuzi, İbn Dəhiyyə, əz-Zəhəbi, İbnul-Qayyim, İbn Kəsir, əz-Zeyn əl-İraqi, İbn Hacər əl-Asqaləni, İbnul-Hummam, əs-Səxavi, əs-Suyuti, əş-Şaukəni və daha bir çox hədis mütəxəssisi zəif sayıblar. Hətta İbn Həzm əz-Zahiri və Əbu Həyyan əl-Əndəlusi hədisin uydurma olduğunu deyirlər. İbn Kəsir "Tuhfətut-Talib bi Marifəti Əhədis Muxtəsar İbn Həcib"də (səh: 165-169) hədisin Ömər bin əl-Xattab'dan gələn rəvayətini qeyd etdikdən sonra deyir: "Bunu "əl-kutub əs-sittə" sahiblərindən heç kimsə rəvayət etməyib və o, zəifdir." Daha sonra alimlərin hədisi rəvayət edən ravi haqqındakı sözlərini zikr edir və hədisin İbn Ömərdən, İbn Abbasdan və Cabirdən gəldiyini zikr etdikdən sonra deyir: "Bunlardan heç bir şey səhih deyildir. Osman bin Səid əd-Dərimi'nin "ər-Raddu aləl-Cəhmiyyə" kitabının əvvəlindəki sözlərindən bu hədisi güclü saydığını anlamaq olar." Lakin elm əhlindən birdən çox zat bu hədisin mənasını qəbul edərək hədisin çoxlu yolla rəvayət olunduğunu əsas gətirib onu həsən sayıblar, yəni dəlil kimi və ya şahid kimi yararlı bir

hədis olduğunu deyiblər. İbn Kəsir'in söylədiyi kimi əd-Dərimi və bizim bu kitabın sahibi əl-Bərbəhəri bunlardan bəziləridir. Məşhur hənəfi mühəddis alim Abdul-Həyy əl-Ləknəvi əl-Hindi "İqamətul-Huccə alə ənnəl-İksərə fit-Təabbudi leysə bi Bid'ə" adlı risaləsində (səh: 48-49; Abdul-Fəttah Əbu Ğuddə təhqiqi) deyir: "Bunu əd-Dəraqutni "əl-Mu'təlif"də və "Ğaraibu Məlik" kitabında, əl-Quda'i "Musnəduş-Şihəb"də, Abd bin Humeyd (öz kitabında), əl-Beyhəqi "əl-Mədxal"də, İbn Adiy "əl-Kamil"də və əd-Darimi və İbn Abdil-Bərr və İbn Asəkir və əl-Hakim və başqaları cümlə quruluşu müxtəlif, lakin mənaları yaxın ləfzlərlə, çox rəvayət kanalı ilə rəvayət ediblər və hamısı zəifdir, necə ki, bu barədə əl-Hafiz İbn Hacər "əl-Kəfi əş-Şəf fi Təxrici Əhədisil-Kəşşəf" adlı kitabında geniş izah vermişdir. Lakin rəvayət yollarının çoxluğu səbəbi ilə həsən dərəcəsinə çatıb və buna görə də onu əs-Sağani həsən saymışdır, necə ki, bunu əs-Seyyid əl-Curcəni "əl-Mişkət" kitabına yazdığı haşiyədə zikr edir; belə ki, o, "alimin abidə üstünlüyü...." hədisi altında deyir: "Onlar peyğəmbərin – aleyhissələm – "səhabələrim ulduzlar kimidir..." sözündə ulduzlara bənzədiliblər. Bunu İmam əs-Sağani həsən saymışdır." əl-Hafiz İbn Hacərin və İbnul-Hummən'in tələbəsi olan məşhur hənəfi mühəddis alim Alləmə Zeynud-Din Qasim bin Qutlubuğa "Xuləsatul-Əfkar Şərh Muxtəsaril-Mənar" adlı kitabında (səh: 158) deyir: "Bunu əd-Dəraqutni və İbn Abdil-Bərr İbn Ömərin hədisindən rəvayət ediblər, bunun mənası Ömərin hədisindən, İbn Abbas'ın hədisindən və Ənəsin hədisindən də rəvayət olunub. Bunların isnadlarında problem vardır, lakin bir-birilərini gücləndirirlər." Böyük üsul alimi İbn Əmiril-Həcc əl-Hələbi "ət-Təqrir vat-Təhbir fi Şərhi Kitəbit-Təhrir"də (3/99) deyir: "Bəli, bu hədislərdən heç biri səhih deyildir. Buradan çıxış edərək Əhməd demişdir: "Səhih olmayan hədisdir." əl-Bəzzar deyib: "Bu söz peyğəmbərdən – salləllahu aleyhi va səlləm – səhih deyildir." Lakin əl-Beyhəqi "əl-İtiqad" kitabında (səh: 160) deyir: "Biz bunu tam, lakin güclü olmayan bir isnad ilə bir hədisdə və sənədi qopuq olan bir başqa hədisdə rəvayət etdik. Səhih hədis isə bunun mənasının bir hissəsini dəstəkləyir və bu, Əbu Musa'nın mərfu hədisidir: "Ulduzlar səmanın əmniyyətidir, ulduzlar itdikdə səmaya vəd olunan gəlir. Mən də səhabələrimin əmniyyətiyəm, mən də getdikdə səhabələrimə vəd olunan baş verəcək. Səhabələrim də ümmətimin əmniyyətidir, səhabələrim getdikdə ümmətimə vəd olunan gələcək." Bunu Muslim rəvayət edib." İbn Əmir əl-Həcc'in sözləri burada bitdi. O da hədisin sənədinin zəif olmasına baxmayaraq bəzi mənalarının səhih olduğunu deyir və bunun üçün əl-Beyhəqi'nin sözlərini zikr etmişdir. əl-Hafiz İbn Hacər – rahmətullahi aleyhi - əl-Beyhəqinin bu sözləri barəsində "Təlxisul-Həbir" kitabında (4/351) deyir: "əl-Beyhəqi doğru söyləyib, (Əbu Musanın hədisi) xüsusilə səhabələrin ulduzlara bənzəmə hissəsinin səhihliyini göstərir, lakin (onlardan istənilən birini) izləməyə gəldikdə isə bu məna Əbu Musa'nın hədisində aşkar deyildir. Doğrudur ki, bu, ulduzlar vasitəsilə yol tapmaq mənasından anlaşılsın. (Əbu Musa) hədisinin zahiri isə səhabənin əsri bitdikdən sonra çıxacaq fitnələrə, sünnətlərin yox olması, bidətlərin üzə çıxması və dünyanın hər tərəfində facirliyin yayılmasına işarədir." İbn Hacər burada əl-Beyhəqi ilə razılaşaraq hədisdə xüsusilə səhabələrin ulduzlara bənzədilməsinin digər səhih hədislərlə dəstəkləndiyini təsdiqləyir. Əlavə edir ki, ulduzlara bənzətmədən həm də anlamaq olar ki, ulduzlar vasitəsilə insan yolunu tapdığı kimi səhabələr vasitəsilə də hidayəti tapa bilər. Məşhur hənbəli imamı Əbul-Xattab əl-Kəlvazəni "ət-Təmhid fi Usulil-Fiqh" kitabında (4/331) deyir: "Burada qəsd olunan adi müsəlmanın onlardan dilədiyinə təqlid etməsinin caiz olmasıdır və yaxud da "məndən rəvayət etdiyində hansını izləsəniz hidayət taparsız" deməkdir." Teymiyyə ailəsindən üç böyük hənbəli aliminin yazdığı "əl-Musəvvadə fi Usulil-Fiqh" kitabında (səh: 326) Şeyxul-İslam İbn Teymiyyə deyir: "əl-Qadi (Əbu Yalə) səhabələrin iki görüşündən biri üzərində tabiinin icma etməsi haqqında

## (Əmr sahiblərini dinləmək və onlara itaət etmək)

**[26]** Allahın sevdiyi və razı qaldığı işlərdə imamları dinləmək və onlara itaət etmək.[47] Kim insanların icması və razılığı ilə xəlifə olarsa o, möminlərin əmiri sayılır. (İmamın) xeyirxah və ya facir olmasından asılı olmayaraq heç kəsə başının üstündə bir imamın olmadığına etiqad edərək gecələmək halal deyildir.[48]

---

dedi: "(Bununla) ixtilaf aradan qalxmır, əksinə digər görüşə dönmək və onu götürmək olar, çünki əl-Əcurri kitabında İbn Ömər'dən belə dediyini rəvayət edir: "Allahın elçisi – salləllahu aleyhi va səlləm – dedi: "Səhabələrim ulduzlar kimidir, hansının sözünü götürsəniz hidayət taparsız." Bunun üzərinə ona deyildi: Bu hədisi necə dəlil gətirirsiz? Halbuki, İsmail bin Said deyir: "Əhməddən peyğəmbərin – salləllahu aleyhi va səlləm – "səhabələrim ulduzlar kimidir, hansını izləsəniz hidayət taparsız" sözlərini dəlil gətirən haqqında soruşdum və dedi: "Bu hədis səhih deyildir." Ona belə cavab verərik: "Əhməd səhabələrin fəziləti haqqında bunu dəlil gətirib və ona etimad edib, belə ki, Əbu Bəkr əl-Xalləl "əs-Sünnə" kitabında deyir: "Ubeydullah bin Hənbəl bin İshaq bin Hənbəl bizə xəbər verdi: Atam mənə rəvayət etdi: Əbu Abdilləhi belə deyərkən eşitdim: "Həddi aşma Muhammədin səhabələrini zikr etməkdədir, çünki Allahın elçisi – salləllahu aleyhi va səlləm – deyib: "Səhabələrim (barəsində sizə) Allahı, Allahı (xatırladıram), onları hədəf etməyin!" (Həmçinin) dedi: "Onlar ulduzlar kimidir, onlardan hansını izləsəniz hidayət taparsız." (əl-Qadi Əbu Yalə) dedi: Bu ləfzi dəlil gətirmişdir, beləliklə bu, (hədisin) ona görə səhih olduğunu göstərir." "əl-Musəvvadə" kitabında hədis haqqında zikr olunan bu sözlər İmam Əhmədin bu hədisin mənasını bəzi məqamlarda səhih olaraq qəbul etməsini göstərir.

[47] Beləliklə Allahın rzasına uyğun olmayan işlərdə heç bir qula itaət etmək caiz deyildir.

[48] Əgər müsəlmanların başlarında şəriətin prinsiplərini icra edən bir imam və ya əmir varsa və müsəlmanlar onu bir imam və ya bir əmir olaraq qəbul ediblərsə, camaatdan ayrılaraq əmr sahibinin vilayətini rədd etmək heç kəsə halal deyildir. Muslim "əs-Sahih"də (1851) rəvayət edir: "Yezid bin Muaviyə'nin zamanında əl-Hərra'dakı hadisələr baş verən bir zaman Abdullah bin Ömər Abdullah bin Muti'in yanına gəldi və (İbn Muti) dedi: "Əbu Abdir-Rahmən üçün bir balış atın!" (İbn Ömər) dedi: "Mən oturmaq üçün gəlməmişəm. Allahın elçisini – salləllahu aleyhi va səlləm – deyərkən eşitdiyim bir hədisi sənə danışmağa gəlmişəm. Allahın elçisini – salləllahu aleyhi va səlləm – belə deyərkən eşitdim: "Hər kim əlini itaətdən üzərsə Qiyamət günü Allahın qarşısına heç bir üzrü olmadan çıxacaq. Hər kim boynunda beyət olmadan ölərsə cahiliyyə ölüsü kimi ölər." Bu və buna bənzər digər hədislər müsəlman əmirlərə itaət etməyin vacibliyini göstərir.

**[27]** Həcc və hərbi döyüş etmək imam ilə keçərlidir. Onların arxasında cümə namazı qılmaq caizdir. Cümə namazından sonra altı rükət namaz qılsın[49] və hər iki rükətin arasında ara versin. Əhməd bin Hənbəl bu şəkildə deyib.

---

Müsəlman əmirə qarşı çıxmaq müsəlman icmasına, birliyinə qarşı çıxmaqdır ki, dinimiz bunu şiddətlə qınamışdır.

[49] Bu, İmam Əhməddən gələn rəvayətlərdən biridir. Səhabələrdən Əli bin Əbi Talib, Əbu Musa və Abdullah bin Ömər bu görüşdə olublar. İbn Əbi Şeybə "əl-Musannəf" kitabında (4/117) deyir: "Huşeym bizə rəvayət etdi, dedi: Ata bin əs-Səib bizə Əbu Abdir-Rahmən'dən belə dediyini rəvayət etdi: "İbn Məsud bizim yanımıza gəldi və bizə cümədən sonra dörd rükət qılmağımızı əmr edərdi. Lakin yanımıza Əli gəldikdə bizə altı (rükət) qılmağımızı əmr etdi, beləliklə Əlinin sözünü götürdük və Abdullahın sözünü tərk etdik." Dedi: "Əvvəl iki, sonra dörd rükət qılardır."...Əbul-Əhvas bizə Əbu İshaq'dan, o da Atadan belə dediyini rəvayət etdi: "İbn Ömər cümə qıldıqdan sonra altı rükət qılardı; birinci iki, sonra dörd qılardı." Əbu Davud "əs-Sünən" kitabında (hədis: 1123) deyir: "Muhamməd bin Abdil-Aziz bin Əbi Rizmə əl-Mərvazi bizə hekayət etdi: əl-Fədl bin Musa bizə Abdul-Hamid bin Cafər'dən, o, Yezid bin Əbi Həbib'dən, o isə Ata'dan, o da İbn Ömər'dən rəvayət etdi: "(İbn Ömər) Məkkədə olarkən və cümə qılarkən önə keçər və iki rükət qılardı, sonra yenə çıxaraq dörd rükət qılardı. Mədinədə olduqda isə cümə qılardı, sonra evinə qayıdardı və həmən iki rükət qılardı, məsciddə isə qılmazdı. Ondan (bu barədə) soruşuldu və dedi: "Allahın elçisi – salləllahu aleyhi va səlləm – belə edərdi." Bu hədisi ət-Tahavi, ən-Nəvəvi, müasirlərdən isə əl-Albani səhih sayıb. Cümədən sonra altı rükət qılmaq Sufyan əs-Səvri, Əbu Yusuf və ət-Tahavi'nin də görüşüdür. Bu barədə məzhəbin görüşünü Allamə əl-Fətuhi "Muntəhə əl-İradət" kitabında (1/360) belə deyir: "Ondan sonra ən az sünnət iki rükətdir, ən çoxu isə altıdır." Bu isə yuxarıda gətirdiyimiz kimi İbn Ömərin edərkən bu əməlini peyğəmbərimizə - salləllahu aleyhi va səlləm – nisbət etməsinə görədir. Lakin İbn Rəcəb – rahmətullahi aleyhi – "Təqrirul-Qavaid va Təhrirul-Fəvaid" kitabında (1/87) deyir: "Əshabımıza gəldikdə isə onlar bunda yalnız səhabələrdən onların altı rükət qılmaqları haqqında nəql olunana istinad ediblər." Sanki İbn Rəcəb zikr etdiyimiz hədisin mərfu hökmündə olduğunu qəbul etməmişdir. Lakin hənbəli alimləri yalnız səhabələrin əməlinə deyil, həm də bu barədə gəlmiş İbn Ömərin hədisinə də əsaslanıblar. Allamə Mustafa əs-Suyuti ər-Ruheybəni "Mətalib Ulin Nuhə fi Şərh Ğayətil-Muntəhə" kitabında (1/872) deyir: "[Ən çoxu isə], yəni cümədən sonra qılınan sünnətdə (ən çoxu) [altı] rükətdir. (İmam Əhməd) bunu deyib. Çünki İbn Ömər deyib: "Allahın elçisi – salləllahu aleyhi va səlləm – bunu edərdi." Bunu Əbu Davud rəvayət edib." İbn Ömərin Məkkədə altı, Mədinədə isə evində iki rükət qılması isə ondan irəli gələ bilər ki, peyğəmbər – salləllahu aleyhi va səlləm – Məkkədə evi olmadığı üçün məsciddə, Mədinədə isə evində qılmışdır. Məşhur hənəfi əl-Ayni alimi – rahiməhullah – Əbu Davudun "əs-Sunən" əsərinə yazdığı şərhində (4/473-474) deyir: "Əgər soruşsalar ki, İbn Ömərin bu cür qılmasındakı hikmət nədir? Deyərəm: O özü cavab verərək bunu Allahın elçisinin etdiyini demişdir. Lakin Allahın elçisinin – aleyhissələm – felindəki hikmətin izahı qaldı. Ola bilsin ki, o, - aleyhissələm – Mədinədə evini namazdan xali etməmək üçün nafiləni orada qılmağa üstünlük vermişdir, lakin Məkkədə isə qalmağa evi olmamışdır, ona görə də Haram məscidi (namaz üçün) daha uyğun olub. Aşkar olan

**[28]** Xəlifəlik İsa ibn Məryəm enənə qədər Qureyşə aiddir.[50]

**[29]** Kim müsəlmanların imamlarindan hər hansı bir imama qarşı çıxarsa[51] o, xaricidir, bununla müsəlmanların birliyini parçalamış, rəvayətlərə müxalif olmuşdur və ölərsə cahiliyyə ölümü ilə ölmüşdür.[52]

---

budur ki, peyğəmbər – salləllahu aleyhi va səlləm – bunu yalnız (Məkkənin) fəthi ilində edib, çünki cümə namazı yalnız Mədinədə məşru edilib. Bunu anla!"

50 Peyğəmbər – salləllahu aleyhi va səlləm – deyir: "İnsanlardan iki nəfər qalana qədər bu iş qureyşin arasında qalmağa davam edəcək." Bunu əl-Buxari (3501) və Muslim (1820) Abdullah bin Ömərin hədisindən rəvayət ediblər. Bu, əhli-sünnətin üzərində icma etdiyi görüşdür, mötəzilə və xavaricdən başqa heç kəs bunda ixtilaf etməyib.

51 Bəziləri yalnış olaraq elə zənn edirlər ki, əmr sahiblərini münkərlərinə, aşkar cinayətlərinə və zülmlərinə görə tənqid etmək, onların ortaya qoyduqları münkərləri əl ilə düzəltmək onlara qarşı çıxmaqdır. Əmirlərə qarşı çıxmağı qadağan edən hədislərin həm də onları tənqid etməyi də qadağan etdiyini deyirlər. Lakin bu, yalnışdır, çünki onlara qarşı silah ilə çıxmaq qadağan olunmuşdur, yoxsa dil ilə və əl ilə onların münkərlərini inkar etmək qadağan olunmayıb. Əksinə səhih hədisdə onların münkərini inkar etmək əmr olunub. İmam Muslim "əs-Sahih"də (1/69) Abdullah bin Məsudun hədisindən peyğəmbərin – salləllahu aleyhi va səlləm – belə dediyini rəvayət edir: "Məndən əvvəl göndərilmiş elə bir peyğəmbər olmayıb ki, onun öz ümmətindən həvariləri və səhabələri olmasın. Onun sünnətini götürürlər və onu nümunə kimi izləyirlər. Onlardan sonra xələfləri gəlir, etmədiklərini deyirlər, əmr edilmədiklərini edirlər. Kim onlarla əli ilə cihad edərsə mömindir, kim onlarda dili ilə cihad edərsə mömindir və kim onlarla qəlbi ilə cihad edərsə mömindir. Bundan sonra imandan xardal dənəsi qədər belə bir şey yoxdur." Doğrudur ki, bu hədisin zahiri mənasını imamımız Əhməd – radiyallahu anhu – problemli qarşılamış və zahirinin digər səbr etmə hədislərinə zidd olduğunu demişdir, çünki hədisin zahiri zalım əmirlərə qarşı cihad etməyi tələb edir. "Məsəil İmam Əhməd" adlı kitabda (səh: 307) Əbu Davud İmam Əhmədə verdiyi sullarından birinin cavabında onun belə dediyini zikr edir: "(Hədisi rəvayət edən) bu Cafər, Əbu Abdil-Həmid bin Cafərdir. əl-Haris bin Fudeyl isə hədisləri məhfuz olmayan ravidir. Bu söz isə İbn Məsudun sözünə bənzəmir. İbn Məsud deyir: "Allahın elçisi – salləllahu aleyhi va səlləm – dedi: "Mənimlə görüşənə qədər səbr edin!" Lakin digər hədis alimləri hədisin səhihliyində ittifaq ediblər və hədisi çox gözəl şəkildə təfsir ediblər. Alləmə İbn Rəcəb "Cəmiul-Ulum val-Hikəm" adlı kitabında (2/248-249) İbn Məsudun bu hədisi haqqında deyir: "Bu, əl ilə əmirlərə qarşı cihad etməyə dəlalət edir. Əbu Davud'un İmam Əhməd'dən gətirdiyi rəvayətində (İmam Əhməd) bu hədisi münkər saymışdır və demişdir: "Bu, peyğəmbərin – salləllahu aleyhi va səlləm – imamların zülmünə qarşı səbr etməyi əmr etdiyi hədislərə müxalifdir." Buna belə cavab vermək olar ki, əl ilə dəyişdirmək döyüşməyi tələb etmir və Əhməd özü (oğlu) Salehin ondan rəvayət etdiyində bunu söyləmişdir. Belə ki, o, demişdir: "Əl ilə dəyişmək qılınc və silah ilə olmur." O zaman əmirlərə qarşı əl ilə cihad etmək onların etdikləri münkərləri əl ilə aradan qaldırmaqdır; onların alkohollu içkilərini dağıtmaq, onlara aid əyləncə alətlərini sındırmaq və buna bənzər əməllər və ya qadir olduğu halda onların əmr etdikləri zülmü əli boşa çıxarmaq buna misaldır. Bunların hamısı caizdir və bunlar ona qarşı vuruşmaq növündən sayılmır və nə də onlara qarşı çıxmaq – hansı ki, haqqında qadağa gəlib – sayılmır, çünki burada mövcud olan ən böyük risk (yaxşılığı)

**[30]** Sultan nə qədər zalım olsa da ona qarşı vuruşmaq və ona qarşı çıxmaq halal deyildir və bu, Allahın elçisinin – salləllahu aleyhi va səlləm – Əbu

---

əmr edənin yalnız özünün öldürülməsi riskidir.” Buradan anlayırıq ki, əli ilə münkəri dəyişmək əmirə qarşı çıxmaq sayılmır. Bu iki hal arasındakı fərqə işarə edərək İmam ən-Nəvəvi “Sahih Muslim” kitabının şərhində (12/229) deyir: “Hədisin mənası budur ki, İslam qaydalarına əsasən bildiyiniz həqiqi bir münkər iş görmədiyiniz müddətdə əmr sahibləri ilə onların vəlayətini mübahisə etməyin, onlara qarşı etiraz etməyin! Beləliklə belə bir münkər görsəniz onlara qarşı onu inkar edin və harada olmağınızdan asılı olmayaraq haqqı söyləyin! Lakin onlara qarşı çıxmaq və onlarla vuruşmağa gəldikdə isə bu, müsəlmanların icması ilə - onlar zalımlar, fasiqlər olsalar belə - haramdır.” Məşhur müsəlman imamların əməlləri də buna şahidlik etməkdədir. əl-Hafiz Abdul-Ğani əl-Məqdisi’nin musiqi alətlərini sındırması, sonra da qazinin çağırışına cavab verməməsi, Şeyxul-İslam İbn Teymiyyənin əmir sahiblərinin əmrinə etiraz olaraq Alləmə əl-Mizzini həbsdən çıxarması bunun ən aydın misallarıdır.

[52] Xaricilər zəlalət firqələrindən biridir. İslam tarixində ilk xaricilərin kim olması haqqında alimlər fərqli fikirlərdə olublar. Elm əhlindən bəzilərinə görə ilk xarici Əlinin Yəməndən göndərdiyi qızılı bölərkən Allahın ən sevimli quluna – salləllahu aleyhi va səlləm – etiraz edən Zul-Xuveysira adlı bir zat olmuşdur. İbnul-Cəvzi, İbn Həzm və əş-Şəhristani bu görüşdə olan alimlərdən bəziləridir. Digər görüşə görə onlar Osmana qarşı çıxmış və onu qətl etmiş kəslərdir və onları xavaric olaraq İbn Kəsir və digərləri adlandırırlar. Üçüncü görüşə görə onlar Həzrəti Əli ilə Müaviyə arasında baş vermiş hakim təyin etmə hadisəsində ortaya çıxan firqədir. Alimlər həm də onların hökmündə də ixtilaf ediblər. Ümmətin böyük əksəriyyətinə görə xaricilər fasiq sayılırlar, hətta əl-Xattabi bu məsələdə ixma olduğunu iddia edib. Elm əhlindən bəziləri isə onları kafir görüb və bu görüş əl-Qadi İbnul-Arabi, ər-Rafi’i, Taqiyyud-Din əs-Subki və Əbul-Abbas əl-Qurtubi’yə nisbət edilib. Bu görüş həm də İmam əl-Buxari’yə aid edilib, lakin xətadır. Xaricilər öz havalarına və cəhalətlərinə əsaslanaraq müsəlman imamları təkfir edənlərə və onlara qarşı üsyan edənlərə verilmiş addır. Lakin burada elm əhlindən ictihad edərək zalımlara qarşı üsyan edənlər ilə öz bidətlərinə əsaslanıb imamlara üsyan edənlər arasında fərq qoymaq lazımdır. İkincilər xavaric adlandırdıqları halda birincilərə bu adı vermək olmaz, əksinə qarşıdakı dipnotda izah edəcəyimiz kimi sələfdə məşhur olan məzhəbə görə zalım imamlara qarşı çıxmaq caiz olmuşdur. əl-Hafiz İbn Hacər – rahiməhullah – əmirlərə qarşı çıxanlar haqqında “Fəthul-Bari” kitabında (16/168) deyir: “Onlar da həmçinin iki qisimdir: (birinci qism) əmirlərin zülmü, onların nəbəvi sünnət ilə əməl etməyi tərk etmələri üzündən din xatirinə qəzəblənərək çıxanlardır və onlar haqq əhlidirlər. Onların arasında əl-Hüseyn bin Əli, əl-Hərra’da (üsyan etmiş) Mədinə əhli və əl-Həccaca qarşı çıxan qarilər yer alır. (İkinci) qism isə şübhələrinin olub olmamasından asılı olmayaraq yalnız mal üçün çıxanlardır və onlar bağilərdirlər.” Şeyxul-İslam İbn Teymiyyə - rahmətullahi aleyhi – bu fərqi fətvasında çox gözəl izah edir və fətvasında təqdim etdiyi geniş izahın içində bunları da deyir: “Cəməl və Siffin’də vuruşmuş səhabələrin vuruşması ilə Zul-Xuveysira ət-Təmimi və sapıq xaricilərdən, həddi aşmış harurilərdən onun əmsallarının vuruşmasını eyniləşdirənlərin sözü cahillərin sözləri növündəndir və aşkar bir zülmdür.” (“Məcmu əl-Fətəva”, 35/56) Əlbəttə ki, zalım imamlara qarşı çıxmış ictihad əhlini xaricilər ilə eyniləşdirmək yalnız cahillərin və zalımların sözü ola bilər.

Zər'ə dediyi sözdür: "Həbəşli bir qul olsa da səbr et!"[53] Ənsara da belə buyurmuşdur: "Məni hovuz başında qarşılayana qədər səbr edin!"[54] Sultan ilə vuruşmaq sünnətdən deyildir, çünki o, dinin və dünyanın pozulmasına səbəb olur.[55]

---

[53] Muslim "əs-Sahih"də (1837) Əbu Zər'in hədisindən rəvayət edir. Dedi: "(Əmir) hətta əl-qolu kəsilmiş bir qul olsa belə xəlilim eşidib itaət etməmi mənə tövsiyə etdi." Bir başqa rəvayətdə isə "əl-qolu kəsilmiş həbəşli bir qul olsa belə" sözləri keçir.

[54] əl-Buxari (3147) və Muslim (1059, 1845) rəvayət edir.

[55] Kafir olmayan, yəni müsəlman olan zalım və ya adil imama qarşı çıxmaq halal deyildir və bu, imamımız Əhmədin və əhli-sünnətin məşhur görüşüdür. Ümumən bu ümmətin ilk nəsillərində bu barədə iki fərqli görüş mövcud olub. Hənəfi imamlarından Əbu Cafər ət-Tahavi əqidə haqqında yazdığı məşhur kitabında (səh: 24) deyir: "İmamlarımıza və əmr sahiblərinə qarşı – zalım olsalar belə - çıxmağı, onların əleyhinə dua etməyi, onların itaətindən əl çəkməyi caiz görmürük." Məlumdur ki, İmam ət-Tahavi müqəddimədə kitabını Əbu Hənifə, Əbu Yusuf və Muhamməd bin əl-Həsənin məzhəbi üzərinə yazdığını deyir. Belə anlaşılır ki, Əbu Hənifə'nin də bu məsələdəki məzhəbi imamımız Əhməd'in məzhəbi ilə eynidir. Lakin məşhur hənəfi alimi Əbul-Bəkr əl-Cəssas təfsirində (1/86) deyir: "Zalımlara və haqsız imamlara qarşı vuruşmaq onun məzhəbi olaraq məşhur idi." Əbu Hənifənin fasiqlərə və zalımlara imamlıq, hakimlik və qazilik məqamını caiz gördüyünü deyənlərin sözünü əl-Cəssas təfsirində şiddətlə inkar edir. Əbu Hənifə'nin öz zamanında başda Zeyd bin Əli'nin üsyanı olmaqla abbasi xəlifələrinə qarşı çıxan üsyanlarda insanlara onlara kömək etmələrinə dair verdiyi fətvası məşhurdur. Bunu dəstəkləyən başqa bir nəqli İmam Əhmədin oğlu Abdullah "əs-Sunnə" kitabında (1/181-182) rəvayət edir: "Əbul-Fədl əl-Xurasəni mənə hekayət etdi; İbrahim bin Şəmməs əs-Səmərqandi mənə hekayət etdi və dedi: Biz (Abdullah) bin əl-Mubarək'in yanında olanda bir nəfər ona dedi: "Əbu Hənifə mürciə idi, qılıncı (yəni zalımlara qarşı çıxmağı) caiz görürdü." Onun bu sözünü İbnul-Mubarək inkar etmədi. Əbul-Fədl əl-Xurasəni mənə hekayət etdi; əl-Həsən bin Musa əl-Əşyəb bizə rəvayət etdi və dedi: Əbu Yusufu belə deyərkən eşitdim: "Əbu Hənifə qılıncı caiz görürdü." Dedim: "Bəs sən?" Dedi: "Allaha sığınıram." Amma hənəfi alimlərinin ümumən kitablarından anlaşılan budur ki, Əbu Hənifənin bu məsələdəki məzhəbi Əhmədin məzhəbinə uyğun olub. Hənəfi alimlərindən Allamə Əbul-Yusr Muhamməd əl-Bəzdəvi "Usulud-Din" kitabında (səh: 196) deyir: "Əgər imam zalım və ya fasiq olarsa Əbu Hənifənin əshabının hamısına görə vəzifəsindən enməz və bu, razı qalınan məzhəbdir." Hənəfi alimi əl-Kəmal ibn Əbi Şərif "əl-Musəmərə" kitabında (səh: 277-278) deyir: "Bir insan [adil olarkən əgər imam seçilərsə, sonra ] hökmündə [zalım olarsa ] və bununla və ya başqa səbəbə görə [fasiq olarsa məqamından enməz.] Lakin [əgər] endirilməsi [fitnəyə səbəb olmazsa endirilməyə layiqdir. Onun] islah olması [üçün dua etmək vacibdir. Ona qarşı çıxmaq vacib deyildir.] Bunu hənəfilər [bu şəkildə Əbu Hənifədən] nəql ediblər." Bu sitatda mötərizə içindəki sözlər hənəfi alimi Kəmalud-Din İbn Huməm'in "əl-Musəyəra fil-Aqaid əl-Munciyyə fil-Axira" kitabındakı sözləridir ki, İbn Əbi Şərif onları "əl-Musəmərə" kitabında şərh edib. İmam əş-Şafi'nin məşhur görüşü bizim məzhəbimizin görüşü ilə eynidir. Lakin məşhur şafi'i alimi Murtəda əl-Hüseyni əz-Zubeydi "İthəfus-Sədətil-Muttəqin bi Şərhi İhyəi Ulumid-Din" kitabında (2/233) deyir: "Fasiqliyə gəldikdə isə iki görüş üzərində ixtilaf edilib. Cumhurun görüşünə görə buna görə (vəzifəsindən)

endirilməz, çünki bu, onun fasiqliyindən də daha böyük bir fitnəyə səbəb ola bilər. əş-Şafi isə əvvəlki məzhəbində endirilməyin lazım olması görüşünü mənimsəmişdir və əl-Məvardi "əl-Əhkəm əs-Sultaniyyə"də sadəcə bu görüşü zikr etməklə kifayətlənmişdir." Şafi'i alimlərindən İmamul-Harameyn əl-Cuveyni bu görüşü dəstəkləmişdir. Bu, həm də İbn Həzmin görüşüdür. Lakin alimlərin böyük əksəriyyətinə görə zalıma qarşı silah ilə qarşı çıxmaq caiz deyildir. Məzhəbimizdə alimlərin əksəriyyəti bu rəyi mənimsəyib. İbn Aqil və İbnul-Cəvzi isə zalım imamlara qarşı çıxmağı caiz görüblər. İbn Muflih "əl-Furu" kitabında (10/180-181) deyir: "İbn Aqil və İbnul-Cəvzi haqqı bərqərar etmək üçün adil olmayan imama qarşı çıxmağı caiz sayıblar; (dəlil olaraq) əl-Hüseyn'in Yezidə qarşı çıxmasını zikr ediblər. Bu cür həm də əl-Cuveyni deyib: "Əgər haqsızlıq edərsə, zülmü aşkara çıxarsa, onu bundan çəkindirsələr də (əməllərindən) əl çəkməzsə hərb və silah yolu ilə olsa belə onu endirmək caizdir." ən-Nəvəvi dedi: "Onu endirmək (görüşü) qəribədir." Bununla belə onun (zülmündən) daha böyük bir fəsadın çıxması qorxusu olmadığı hala aid edilməlidir. İmam Əhmədin isə sözləri bunun halal olmamasını, bunun sünnətə və səbr etmə əmrinə müxalif olan bidət olmasını göstərir. Əgər qılınc araya girərsə fitnə hər yeri bürüyər, yollar kəsilər, qanlar tökülər, mallar mübah edilər və haramlar çeynənilər. Şeyximiz dedi: Baş vermiş fitnələrin hamısının ən böyük səbəbi səbrin azlığıdır, çünki fitnənin iki səbəbi var: ya elmin azlığı, ya da səbrin azlığı, beləliklə cahilliklə və zülm şərrin əslidir. Şərri edən onu yalnız onun şərr olmasından cahil olduğu və özünün bunu istədiyi üçün edir və cahillik elm ilə aradan qalxır. Səbr ilə nəfsi istəklər və şəhvətlər həbs edilir, beləliklə fitnə zail olur. İbnul-Cəvzi "əs-Sirrul-Məsun" kitabında deyir: "Özlərini sünnətə nisbət edən camaatda geniş yayılmış avam etiqadlardan biri də onların belə deməsidir: "Yezid doğru edib və əl-Hüseyn ona qarşı çıxmaqda xəta edib." Əgər tarixə baxsalar onun beyətinin necə baş verdiyini, insanları ona məcbur etdiyini görəcəklər. Bunun üçün hər çirkin işi görmüşdür. Hətta onun xəlifəliyinin səhih olduğunu hesab etsək belə sonradan çoxlu məsuliyyətsiz işlər gördü ki, bunların hamısı (xəlifəlik) əqdinin pozulmasını gərəkdirir. Mədinədə etdiyi soyğunçuluq, Kəbəni mancanaqla atəşə tutması bunlardan bəziləridir, əl-Hüseyni və onun ev əhlini öldürdü, onun qarşı dişlərinə əsa ilə vurdu, başını taxta üzərində daşıdı." Həmçinin Şeyx Mustafa əs-Suyuti ər-Ruheybəni "Mətalibu Ulin-Nuhə" kitabında (6/267) İbnul-Cəvzinin görüşünü və əl-Hüseynin üsyanını zikr etdikdən sonra deyir: "Bunun tələbi budur ki, bəzi avtoritet və söz sahibləri daha əvvəl Yezidə beyət etmiş olsalar da – və bu, onun fasiqliyinin və qorxusuzluğunun çirkinlikləri böyük dərəcəyə çatsa belə imamlıq haqqının ona olduğunu isbat edir - əl-Hüseynin ona qarşı çıxması caiz idi. əl-Hüseynin ictihadı Yezidə qarşı çıxmağın caizliyini və ya vacibliyini tələb edirdi, çünki onun qulaqları kar edəcək qədər zülmü və çirkinlikləri var idi və o, ondakının miqdarı qədər buna layiq idi. Muaviyənin əl-Həsənin onun xeyrinə xəlifəlikdən enmədən öncə onunla və Əli ilə olan halı da bunun bənzəridir, çünki (Müaviyə) o ikisinə qarşı təcavüzkar və həddi aşmış biri idi, lakin ictihadına görə günahkar deyildi. əl-Hüseyn də onun kimidir. Lakin zalıma qarşı çıxmağın haram olmasına dair hökmlər yerini tutduqdan sonra və bu barədə icma hasil olduqdan sonra ona qarşı çıxmaq caiz deyildir." Şeyxin bu sözlərinin izahı budur ki, əvvəlki alimlər bu məsələdə ittifaq halında deyil, ixtilaf halında olublar, çünki səhabədən, tabiindən və sonra gələn alimlərdən bir çoxu zalım əmirlərə qarşı çıxmağın caiz olması görüşündə olublar. Lakin sonradan məsələ haqqında alimlərin görüşləri bir olur və icma hasil olur. Bu icmanı İmam ən-Nəvəvi və başqaları nəql ediblər.

**[31]** Müsəlmanların canlarına, mallarına və ailələrinə toxunduqları təqdirdə xavariclərə qarşı vuruşmaq halaldır. Ondan əl çəkdikləri halda onları axtarmaq, yaralılarının həyatına son qoymaq, qənimətlərini almaq, əsirlərini öldürmək, qaçanlarının arxasına düşmək olmaz.[56]

**[32]** Bil ki, - Allah sənə rəhm etsin! – Allaha – Azzə va Cəllə - üsyan etmək əmr olunduqda bəşərə itaət etmək olmaz.

**[33]** Kim İslam əhlindəndirsə, onun haqqında xeyir və ya şərr ilə şahidlik edilməz, çünki ölərkən hansı hal üzərində qurtaracağını bilmirsən. Ona Allahın rəhmətini ümid edirsən, günahlarına görə halı üçün qorxmalısan. Ölüm zamanı Allah qarşısında onun peşman olub olmayacağını bilmirsən, əgər İslam üzərində ölərsə həmin halda Allahın ona nə hazırladığını bilmirsən. Onun üçün Allahın rəhmətini arzu edir, günahlarına görə onun halı üçün qorxursan. Qulun hər bir günahdan tövbə etmək imkanı vardır.

---

[56] Çünki onlar müsəlman sayılırlar, müsəlmanlara qarşı vuruşmaq isə yalnız zərurətdə caizdir. əl-Qadi Əbu Bəkr İbn əl-Arabi "Əhkəmul-Quran" kitabında (4/154) deyir: "Əsirləri öldürülməz, məğlub olanları təqib olunmaz, çünki məqsəd onları öldürmək deyil, onları dəf etməkdir...Bütün bunlarda bizə görə əsaslandığımız dəlil daha əvvəl qeyd etdiyimiz kimi budur ki, səhabələr – radiyallahu anhum – öz yürüşlərində qaçan birini təqib etməyiblər, yaralı birini öldürməyiblər, nə də bir əsiri öldürməyiblər, (bağilərlə savaşda tələf etdikləri) bir cana, nə də bir mala görə təzminat ödəməyiblər və onlar (bizim üçün) örnəkdirlər."

## (Şəriət əhkamlarının təsdiqi)

**[34]** Daş-qalaq haqdır.[57]

**[35]** Xuflara məsh çəkmək sünnətdir.[58]

**[36]** Səfərdə namazı qısaltmaq sünnətdir.

**[37]** Səfərdə oruc tutmaq; kim istərsə oruc tutar, istərsə tutmaz.

**[38]** Şalvarda namaz qılmaqda bir problem yoxdur.[59]

---

[57] əl-Buxari (6830) və Muslim (1691) – rahiməhuməllah – İbn Abbas'dan rəvayət edirlər: "Ömər bin əl-Xattab peyğəmbərin – salləllahu aleyhi va səlləm – minbəri üstündə oturarkən belə dedi: "Şübhəsiz ki, Allah Muhamməddi – salləllahu aleyhi va səlləm – haqq ilə göndərib və Kitabı ona nazil edib. Allahın nazil etdikləri arasında rəcm ayəsi də var idi; onu birlikdə oxuduq, birlikdə anladıq və birlikdə öyrəndik. Allahın Elçisi – salləllahu aleyhi va səlləm – rəcm etdi və biz də ondan sonra rəcm etdik. Uzun bir zaman keçdikdən sonra insanlardan kiminsə "Allaha and olsun ki, rəcm ayəsini Quranda tapa bilmirik" deyərək Allahın nazil etdiyi bir fərzi tərk etməklə yolunu azacağından qorxuram. Dəlillə isbat olunduqda və ya (qadın) hamilə qaldıqda və ya etiraf edildikdə evli olduqları halda zina etmiş kişi və qadını rəcm etmək Allahın kitabında mövcud olan bir haqdır."

[58] Bu cür əqidə kitablarında xuflara məsh etmək kimi bir fiqhi məsələnin zikr edilməsindəki hikmət sünnətin şəriətdəki yerinə işarə etməkdir, çünki xuflara məsh çəkmək mütəvatir sünnət ilə sabit olduğu üçün onu yalnız bidət əhli inkar edə bilər. İmam ət-Tahavi də bu məsələni əqidə kitabında zikr etmişdir.

[59] ət-Tabərani'nin "əl-Mucəm əl-Əvsət"də (7833) Cabir bin Abdilləh'dən rəvayət etdiyi hədisdə deyilir ki, peyğəmbər – salləllahu aleyhi va səlləm – şalvarda namaz qılmağı qadağan etdi. Lakin hədis zəifdir və İbnul-Cəvzi "əl-İləl əl-Mutənəhiyə" kitabında (2/681) deyir: "Bu hədis peyğəmbərdən – salləllahu aleyhi va səlləm – səhih deyildir. əl-Uqeyli deyir: "Bu hədis yalnız Hüseyn bin Vardən vasitəsilə tanınır və ondan başqası bunu rəvayət etməyib."

## (Hökmlər zahirə görə verilir)

**[39]** Nifaq isə İslamı üzdə göstərib küfrü gizlətməyindir.

**[40]** Bil ki, dünya bir iman və islam evidir, buna əsasən də Muhamməndin – salləllahu aleyhi va səlləm – ümməti orada hökmlərdə, miras hüquqlarında, kəsdikləri heyvanlarda, cənazələrində möminlər, müsəlmanlar sayılırlar. İslamın bütün şəri əmrlərinə riayət etmədikcə heç kəsin həqiqi mömin olmasına dair şahidlik etmə! Kim bunlardan birində ölənə qədər qüsura yol verərsə, imanında naqis biri sayılacaq, imanı haqqında həqiqi elm, yəni imanının tam olması yoxsa naqis olması haqqındakı elm isə Allahu Təaləyə aiddir. İslamın şəri əmrlərini zay etmək kimi etdikləri əməllərdən sənə görünənlər istisnadır.

**[41]** Qiblə əhlindən ölən bir kimsəyə cənazə qılmaq sünnətdir: daş-qalaq olunmuş birinə, zinakar kişi və qadına, özünü öldürənlərə[60], qiblə əhlindən olan digərlərinə, sərxoşa və digərlərinə cənazə qılmaq sünnətdir.

---

[60] Muslim "əs-Sahih"də (978) Cabir bin Səmura'nın – radiyallahu anhu - hədisindən rəvayət edir: "Peyğəmbərin - salləllahu aleyhi va səlləm – yanına özünü "məşaqis" ilə öldürmüş birini gətirdilər və ona (cənazə) namazı qılmadı." ən-Nəvəvi "Şərh Sahih Muslim"də (7/47) deyir: ""Məşaqis" geniş oxlardır, təkinə "mişqas" – kəsrəli mim hərfi və fəthəli qaf hərfi ilə - deyilir. Üsyan etmiş olduğuna görə özünü öldürənə namaz qılınmayacağını deyənlər üçün bu hədisdə bir dəlil vardır və bu, Ömər bin Abdil-Aziz'in və əl-Əvzai'nin məzhəbidir. əl-Həsən (əl-Basri), (İbrahim) ən-Nəxai, Qatədə, Malik, Əbu Hənifə, əş-Şafi və alimlərin böyük əksəriyyəti isə deyir ki, belə birinə namaz qılınar. Onlar bu hədisə cavab olaraq deyiblər ki, peyğəmbər – salləllahu aleyhi va səlləm - insanları onun etdiyi bir əməldən çəkindirmək üçün yalnız özü namaz qılmadı və səhabələr isə ona namaz qıldılar. Bu isə İslamın əvvəlində peyğəmbərin – salləllahu aleyhi va səlləm – boynunda borc olana namaz qılmağı tərk etməsi kimidir ki, bununla borc almaqda qeyri-ciddi olmaqdan, borca vəfada ehmalkar olmaqdan çəkindirirdi, lakin səhabələrə isə onun üçün namaz qılmağı əmr etdi və o, - salləllahu aleyhi va səlləm - dedi: "Dostunuz üçün namaz qılın!" əl-Qadi (İyad) dedi: "Bütün alimlərin məzhəbi budur ki, bütün müsəlmanlar üçün, hədd olunmuş, rəcm (daş-qalaq) olunmuş, özünü öldürmüş, zinadan doğulmuş hər bir müsəlman üçün namaz qılınmalıdır. Malikdən və başqasından isə rəvayət olunur ki, imam həddə öldürülmüş (yəni İslam hökmü ilə edam

**[42]** Allahın Kitabından bir ayəni rədd etmədiyi, Allahın elçisinin – salləllahu aleyhi va səlləm - əsərlərindən birini rədd etmədiyi, Allahdan başqası üçün heyvan kəsmədiyi və ya Allahdan qeyrisinə namaz qılmadığı təqdirdə qiblə əhlindən heç kimsəni İslamdan çıxarmırıq. Əgər bunlardan birini etsə onu İslamdan çıxarmaq sənə vacib olmuşdur və əgər bunlardan heç birini etməyibsə o, həqiqətdə yox, adda müsəlmandır, mömindir.

---

edilmiş) biri üçün namaz qılmaqdan çəkinməli və (insanlar arasında) fəzilət sahibləri fasiqlər üçün namaz qılmamalıdırlar ki, onları bundan çəkindirsinlər...” İmam ən-Nəvəvi’nin bu sözlərindən anlaşıldığı kimi ümumən bu məsələdə ittifaq vardır. Muslim’in hədisinə gəldikdə isə bunun ən-Nəsai’dəki rəvayətində (1964) peyğəmbər – salləllahu aleyhi va səlləm – deyir: “Mənə gəldikdə isə mən onun üçün namaz qılmıram.” Yəni yalnız özü qılmaq istəməmiş, lakin digərlərinə qıldırmışdır.

## (Allahın sifətlərini təsdiqləmək və onlara iman gətirmək)

**[43]** Allah elçisinin – salləllahu aleyhi va səlləm – "Qulların qəlbləri ər-Rahmənin barmaqlarından iki barmağı arasındadır[61]"[62] və onun "Həqiqətən Allah – Təbərakə va Təalə - dünya səmasına enir[63]"[64] sözü, Arafə günü[65] və

---

[61] Muslim, "əs-Sahih", (2654);

[62] Əhlus-Sunnət etiqad edir ki, Allahu Təalənin Özünə yaraşan barmaqları vardır. Bidət əhlindən başqa heç kəs bunu inkar etməmişdir. Əbu Bəkr İbn Xuzeymə "ət-Təuhid" kitabında (1/187) "Allah üçün – azzə va cəllə - barmaqların isbatı" adlı bir bab açıb. Əbu Bəkr əl-Acurri "əş-Şəriah" kitabında (2/115) "insanların qəlblərinin Rəbbin – azzə va cəlləm – barmaqlarından iki barmağı arasında olmasına keyfiyyətsiz iman etmək" adında bab açmışdır. Həmçinin İbn Bəttah "əl-İbənə" kitabında eyni adlı bab açmışdır. Bu haqda həmçinin İbn Əbi Asim "əs-Sünnə"də, İbn Məndəh "ər-Raddu aləl-Cəhmiyyə" kitabında, əd-Dəraqutni "əs-Sifət" kitabında və Şeyxul-İslam əl-Həravi "əl-Arbəin fi Dələil ət-Təuhid" kitabında ayrıca fəsil açıblar və bu sifəti isbat ediblər. İmam əl-Bəğavi "Şərhus-Sunnə" kitabında (1/168) deyir: "Hədisdə zikr olunan barmaq Allahın – azzə va cəllə - sifətlərindən bir sifətdir. Eynilə Kitab və sünnətdə gəlmiş bu qəbildən olan nəfs, üz, göz, əl, ayaq, gəliş, dünya səmasına eniş, Ərşin üzərinə yüksəliş, gülüş və sevinc kimi Allahu Təalənin sifətləri də bunun kimidir." Bidət əhli hədislərdə gəlmiş barmaq sifətini təvil edərək onun "nemət" anlamına gəldiyini dedilər. Əhli-sunnət imamlarından olan İbn Quteybə onlara gözəl cavab verərək "Təvil Muxtələf əl-Hədis" kitabında (səh: 302-303) deyir: "Biz deyirik ki, bu hədis səhihdir və onların barmaq sözünə verdikləri təvil hədisə uyğun gəlmir, çünki o, - aleyhissələm – duasında dedi: "Ey qəlbləri çevirən! Qəlbimi dinim üzərində sabit et!" Zövcələrindən biri ona dedi: "Ey Allahın elçisi! Sən də öz nəfsin üçün qorxursanmı?" Dedi: "Şübhəsiz ki, möminin qəlbi Allahın – azzə va cəllə - barmaqlarından iki barmağı arasındadır." Əgər onlara görə qəlb Allahu Təalənin nemətlərindən iki nemət arasındadırsa o zaman o qəlb iki nemət ilə qorunmuşdur. Bəs onda nə üçün sabit olmasını dua etmişdir?! Bəs nə üçün ona "sən də öz nəfsin üçün qorxursanmı?" deyən qadına qarşı qadının sözünü dəstəkləyən bir şeyi dəlil gətirdi?! Əgər qəlb iki nemət arasında qorunulursa o zaman qorxmaq lazım deyildir."

[63] əl-Buxari, "əs-Sahih", (1145); Muslim, "əs-Sahih", (758)

[64] Bu məsələdə ümmətin sələfi icma edib. Şeyxul-İslam İbn Teymiyyə "Məcmu əl-Fətəva"da (5/577) Əbu Ömər ət-Talmənki'dən bu barədə sələfin icmasını nəql edib. Lakin sələf bununla bağlı iki məsələdə ixtilaf edib. Birinci məsələ budur: Allahın enməsi hərəkət və intiqal (bir yerdən başqa yerə köçmək) etmək deməkdir ya yox? Bu barədə iki görüş vardır. əl-Qadi Əbu Yalə "əl-Məsəil əl-Aqadiyyə min Kitəbir-Ravayəteyn val-Vacheyn" kitabında (səh: 62) deyir: "Peyğəmbərimizin – salləllahu aleyhi va səlləm – xəbər verdiyi kimi hər gecə gecənin son üçdə biri qaldıqda Allahu Təalənin dünya

Qiyamət günü[66] enir, Allah – Cəllə Sənəuhu – ayağını cəhənnəmə qoymadıqca (insanların) ora atılması davam edəcək[67], Allahın quluna dediyi "Mənə tərəf yürüsən sənə tərəf qaçaram"[68] sözləri[69], (peyğəmbərin)

---

səmasına enməsində əshabımız (yəni hənbəlilər) ixtilaf etməyib... Bunun sifətində ixtilaf ediblər. Şeyximiz Əbu Abdilləh (əl-Həsən bin Həmid) enmənin intiqal olması görüşündədir. O, deyir ki, "çünki ərəblərə görə enişin həqiqəti budur." Bu, onun (İbn Həmidin Ərşin üzərinə) yüksəliş məsələsindəki görüşünün eynisidir, yəni oturmaq mənasındadır. Bu, Ubədə bin Samitin hədisinin zahirinə əsaslanır. Üstəlik bu, ən uzağı biz insanların haqqında yaradılmış sifətlərdən birini ifadə edir, lakin bu, bunun Allah haqqında da yaradılmış olmasını tələb etmir. Ərşin üzərinə yüksəlmək bunun kimidir, qədimdə bu yüksəliş ilə vəsf olunmasa belə (yüksəliş) şəklində biz Ondan fərqli olmaqla bərabər O, bu sifət ilə vəsf olunur. Eynilə deyirik ki, O, səs və hərf ilə danışmışdır; belə bir şey bizə aid vəsflərdə yaradılmış olmağı tələb etsə də Onun haqqında belə bir şey tələb etmir. Enmək də bunun kimidir. Şeyximiz əshabımızdan bir qrupdan onların belə dediyini nəql etmişdir: "Enməyin mənası qüdrətinin enməsidir"...Şeyximiz əshabımızdan digər bir qrupdan onların belə dediyini nəql etmişdir: "Mənasını əql edə bilməyəcəyimiz enişlə sabitdir; bunun mənası xəbərdə gəldiyi kimi zəval ifadə edir ya yox? Belə bir şey Onun sifətlərində imkansız deyildir, necə ki, Allah üçün bir zat isbat edir, lakin onun mahiyyətini nəfy edir. Bu (axırıncı) yol məzhəbin görüşüdür, belə ki, Əhməd bir çox yerdə bunu bildirmişdir." əl-Qadi Əbu Yalə burada enmək sifətinin mənası haqqında üç görüş nəql etmişdir. İlk görüşə görə enmək bir yerdən başqa yerə köçmək deməkdir, çünki ərəblər bunu bu cür başa düşürlər və bu, İbn Həmidin görüşüdür. İkinci görüşə görə burada qəsd olunan Allahın qüdrətinin enməsidir. Lakin bu görüş xətadır və bu xətanın izahı üçün bura uyğun yer deyildir. Üçüncü görüşə görə bunun mənasını dərk etmək olmaz və bundan ötəyə keçmək doğru deyildir. əl-Qadi Əbu Yalə qeyd edir ki, məzhəbin doğru görüşü budur.

[65] Bax: Muslim, "əs-Sahih", (1348);

[66] Allahu Təalə deyir: "Xeyr! Yer dağılıb parça-parça olacağı, sənin Rəbbin və səf-səf mələklər gələcəyi və cəhənnəm gətiriləcəyi gün - məhz o gün insan xatırlayacaqdır." (əl-Fəcr, 21-23)

[67] Bax: əl-Buxari, "əs-Sahih", (4848); Muslim, "əs-Sahih", (2848)

[68] əl-Buxari, "əs-Sahih", (7405); Muslim, "əs-Sahih", (2675)

[69] Allahın "qaçmaq" sifəti varmı? Sələf bu barədə iki görüşə ayrılmışdır. Onlardan bəziləri hədisdə gələn qaçmağın Allahın sifəti olmadığını, lakin kinayə olaraq deyildiyini söyləyir. Bu görüşə əsasən burada qəsd olunan Allahın qulunun əməllərini qəbul etməkdəki surətidir. Bu görüşdə olanlardan biri də İbn Quteybədir. O, "Təvil Muxtələf əl-Hədis" (səh: 327) kitabında deyir: "Biz deyirik ki, bu bənzətmə və misal vermək anlamındadır. Bununla sadəcə olaraq qəsd etmişdir ki, kim itaət etməklə sürətlə Mənə gələrsə Mən onun gəlişindən də daha surətli ona savab yazaram, beləliklə bunun üçün yürüyüş və qaçışı kinayə olaraq istifadə etmişdir. Bəzilərinə görə isə bu, Allahın sifətlərindən bir sifətdir. Müəllifin kitabdakı əməli göstərir ki, ona görə bu, Allahın sifətlərindən bir sifətdir." Bu, həm də İbn Teymiyyənin "Bəyanu Təlbisil-Cəhmiyyə" kitabında (6/101-104) dəstəklədiyi görüşdür. İkinci görüşə görə bu, Allahın sifətlərindən bir sifətdir və isbat olunmalıdır. Görünür ki, əl-Bərbəhəri bu görüşdə olanlardan biridir. Həmçinin Şeyxul-İslam əl-Hərəvi "əl-Arbəin fi Dəlail ət-Təuhid" kitabında (səh: 79) bu sifəti Allahın sifəti olaraq isbat etmişdir.

"Şübhəsiz ki, Allah – Təbərakə va Təalə - Arafə günü enir" sözləri, "Həqiqətən Allah Adəmi Öz surətində yaradıb"[70] sözləri və peyğəmbərin – salləllahu aleyhi va səlləm – "Həqiqətən mən Rəbbimi ən gözəl surətdə gördüm"[71] sözləri və buna bənzər hədislər kimi əqlinlə dərk edə bilmədiyin əsərlərdən eşitdiyin hər bir şeyə münasibətdə sənə vacib olan onlara təslim olmaq, onları təsdiq etmək, təvfid etmək[72], onlardan razı qalmaq və öz havan ilə bunlardan bir şeyi təfsir etməməkdir, çünki bunlara iman gətirmək vacibdir. Beləliklə bunlardan hər hansı bir şeyi kim öz havasına əsasən təfsir edərsə və ya rədd edərsə o, cəhmidir.

**[44]** Kim dünyada Rəbbini gördüyünü iddia edərsə o, Allaha qarşı kafirdir.[73]

---

[70] əl-Buxari, "əs-Sahih", (6227); Muslim, "əs-Sahih", (2841); Bu məsələdə edilən xətalardan biri də hədisdə "öz surətində" sözündəki əvəzliyi Allaha deyil, Adəmə aid etməkdir. Bununla hədisi təvil edərək Allahın Adəmi ona layiq sifətdə yaratdığını demək istəyirlər. Lakin bu, xətadır və bu xətanın əsli bu cür hədisləri təvil edən və ya inkar edən cəhmiyyə məzhəbinə dayanır və əhli-sünnətdən bəzi imamlar da bu məzhəbə tabe olaraq xətaya yol veriblər. Şeyxul-İslam İbn Teymiyyə "Bəyən Təlbisil-Cəhmiyyə fi Təsisi Bidəihim əl-Kələmiyyə" kitabında (6/373-377) deyir: "İlk üç nəsildən olan sələf arasında burada əvəzliyin Allaha aid olması haqqında heç bir ixtilaf olmayıb, çünki bu, bir ədəd səhabədən çox saylı yollarla geniş yayılmış olaraq gəlmişdir və hədislərin hamısının məzmunu buna dəlalət edir...Lakin üçüncü yüzillikdə cəhmiyyə yayıldığı üçün (hədisin təvili) üzə çıxdı, bir qrup buradakı əvəzliyi Allahdan qeyrisinə aid etdilər, hətta bu fikir Əbu Səvr, İbn Xuzeymə, Əbuş-Şeyx əl-Əsbəhani və başqaları kimi bütün işlərdə elm və sünnət ilə tanınmış bir qrup alimdən də nəql olunub. Buna görə də din imamları və başqalarından ibarət sünni alimləri onların (bu görüşlərini) inkar etdilər." İbn Teymiyyənin bu sözlərindən anlaşılır ki, sələfin görüşünə görə buradakı əvəzlik Allaha aiddir və buna görə də Allahın surəti olduğuna iman etmək vacibdir. Bu surətin keyfiyyəti, necəliyi məlum deyildir, məchuldur. Məşhur alim İmam İbn Quteybə "Təvil Muxtələf əl-Hədis" kitabında (səh: 322;) deyir: "Mənə görə - doğrusunu Allah bilir! – surət heç də iki əldən, barmaqlardan, gözdən təəccüblü deyildir. Sadəcə olaraq bunlar Quranda gəldiyi üçün qəbul görmüş, bu isə Quranda gəlmədiyi üçün qəriblik görmüşdür. Biz hamısına iman gətiririk və bunlardan heç birində nə keyfiyyəti, nə də həddi barəsində söz açmırıq." İbn Quteybə'nin bu sözlərini İbnul-Bənna əl-Hənbəli "əl-Muxtar fi Usulis-Sunnə" kitabında (səh: 145) təsdiq məqamında nəql etmişdir. İmam Əhməd ibn Hənbəl bu görüşün cəhmilərin görüşü olduğunu açıq şəkildə bildirmişdir.

[71] ət-Tirmizi (3235) və Əhməd (5/243; rəqəm: 22109) rəvayət edib. ət-Tirmizi'nin qeyd etdiyi kimi İmam əl-Buxari bu hədisi səhih saymışdır.

[72] Yəni keyfiyyətini, necəliyini "təfvid" etmək, Allaha həvalə etmək

[73] Bəşər övladı Rəbbini bu dünyada ayıq şəkildə görə bilməz. Şeyxul-İslam İbn Teymiyyə deyir: "Ümmətin sələfi və imamları icma ediblər ki, möminlər Axirətdə Allahı öz gözləri ilə görəcəklər. (Həmçinin) icma ediblər ki, Onu bu dünyada öz gözləri ilə görə bilməzlər və bunun peyğəmbərdən – salləllahu aleyhi va səlləm – başqası haqqında (baş verib verməməsində) ixtilaf etməyiblər. Ondan "əs-Sahih"də belə dediyi sabit olmuşdur: "Bilin ki, sizdən heç biriniz ölənə qədər Rəbbini görməyəcək." İnsanlardan kim övliyaların və

**[45]** Allahı – Təbərakə va Təalə - fikirləşmək bidətdir, çünki Allahın elçisi – salləllahu aleyhi va səlləm – deyir: "Yaradılmışlar barəsində fikirləşin və Allah haqqında fikirləşməyin!"[74] Üstəlik Allah haqqında fikir yürütmək insanın qəlbində şəkk doğurur.

***

**[46]** Bil ki, zəhərli, yırtıcı heyvanlar, qarışqalar, milçəklər kimi heyvanların hamısı əmrlər ilə yaşayırlar və Allahın – Təbərakə va Təalə - izni olmadan bir şey etmirlər.

**[47]** Baş vermiş və baş verəcək işlərdən hələ də baş verməmiş olanlarını zamanın lap əvvəlindən Allahın – Təbərakə va Təalə - bildiyinə iman etmək. Onları hesablamış və bir-bir saymışdır. Hər kim – "O, baş vermiş şeyləri və baş verəcək şeyləri bilmir" – deyərsə Əzəmətli Allaha küfr etmişdir.

---

ya başqalarının bu dünyada Allahı öz gözü ilə gördüyünü deyərsə, xüsusilə də onların Musadan daha fəzilətli olduqlarını iddia edərsə, o, bidətçi və sapıqdır, Kitaba, sünnətə və ümmətin sələfinin icmasına müxalifdir; onlar tövbəyə dəvət olunarlar, tövbə etsələr (gözəl), əks təqdirdə isə öldürülməlidirlər." ("Məcmu əl-Fətəva", 6/512) Səhabələrin ixtilafı isə peyğəmbərin – salləllahu aleyhi va səlləm – Meracda olarkən Allahı görüb görməməsində olmuşdur. Bil ki, bu dünyada bizim Allahı görməyimizin mümkünsüzlüyü ona əsaslanır ki, şəriət bunun baş verməyəcəyini xəbər vermişdir, yoxsa Allahın Özlüyündə bu dünyada görünməsi mümkündür. Şeyx İbn Əbil-İzz əl-Hənəfi "Şərhul-Aqidətit-Tahaviyyə" kitabında (səh: 224) deyir: "əl-Qadi İyad'ın – rahiməhullah - dediyi bu söz haqdır, çünki dünyada (Allahı) görmək mümkündür, çünki əgər mümkün olmasaydı Musa – aleyhissalam – onu soruşmazdı."

[74] Bunu bu ləfz ilə Əbuş-Şeyx əl-Əsbəhani "əl-Azamə" kitabında (səh: 214-215; rəq: 4) Əbu Zərdən rəvayət edir. əs-Suyuti bunu "əl-Cami əs-Sağir"də (1/132) gətirir və Əbuş-Şeyxə nisbət edir və zəif olduğuna işarə edir. "əl-Cami əs-Sağir" kitabını təhqiq etmiş Şeyx əl-Albani də hədisi zəif saymışdır. Bu hədis İbn Abbas'dan və başqalarından da rəvayət edilmişdir. Şeyx əl-Albani bu və digər şahidlərə görə bunu "əs-Silsilə əs-Sahihə"də (3/395; rəqəm: 1788) həsən dərəcəsinə qədər qaldırmışdır.

## (Müsəlmanın namusu və qanı haramdır)

**[48]** Vəli, iki adil şahid və mehrsiz – az və ya çox olsun – nikah yoxdur![75] Əgər birinin vəlisi yoxdursa, o zaman sultan vəlisi olmayanların vəlisidir.

**[49]** Əgər kişi qadınını üç dəfə boşayarsa, qadın ona haram olar. Ondan başqa kişiyə ərə getmədikcə ona halal olmaz.

**[50]** Allahdan başqa haqq məbud olmadığına şahidlik edən və Allahın elçisi Muhammədin Onun qulu və elçisi olduğuna şahidlik edən müsəlman bir nəfəri bu üç səbəbdən başqa hallarda öldürmək halal deyildir: evləndikdən sonra zina edən biri, iman etdikdən sonra mürtəd olanı, haqsız yerə mömin bir canı öldürən, bunlara görə öldürülür. Bu üç haldan başqa hallarda Qiyamət qopana qədər müsəlman bir nəfərin qanı digər müsəlmana həmişə haramdır.

---

[75] Müəllifin qeyd etdiyi bu məsələ fiqhi bir məsələdir. Bu məsələdə Əbu Hənifə digər üç imama müxalif olaraq qadının özünü nikahlamasını səhih saymışdır. Hənəfi fəqihləri bu məsələdə Quran ayəsinin zahirinə əsaslanmışlar. İstənilən halda bu məsələ ictihadi məsələlərdən biridir. Müəllifin bu məsələni kitabında qeyd etməsindəki məqsədinin nə olduğunu Allah bilir. Lakin anlaşılan budur ki, müəllif məsələ barəsində gəlmiş hədisləri qəbul edib onlarla əməl etməyi sünnətin tələbi olaraq gördüyü üçün bununla rəy əhlinin mövqeyini inkar etmək istəmişdir. Doğrusunu Allah bilir!

## (Axirət haqdır)

**[51]** Allahın sonda məhv olmağı vacib etdiyi hər bir şey məhv olacaqdır, yalnız Cənnət, Cəhənnəm, Ərş, Kürsi, Lövhə, Qələm və ruhlar istisnadır.[76] Bunlardan heç bir şey heç bir zaman məhv olmayacaq. Sonra Allah Qiyamət günü yaratdıqlarını öldükləri hal üzərində yenidən yaradacaq və dilədiyi ilə onları hesaba çəkəcək. Onların bir hissəsi Cənnətə, bir hissəsi isə Cəhənnəmə girəcək və əbədi qalmaq üçün yaratmadığı digər məxluqlara – "Torpaq olun!" – deyəcək.

**[52]** Qiyamət günü yaradılmışların hamısının, Adəm övladları, yırtıcı və zəhərli heyvanların hamısının arasında qisasın olacağına iman etmək; hətta kiçik qarışqa digər kiçik qarışqadan (haqqını alacaq). Allah – Azzə va Cəllə - bəzilərinin (haqqını) digərlərindən alacaq, cənnət əhli üçün cəhənnəm əhlindən, cəhənnəm əhli üçün cənnət əhlindən, cənnət əhli bir-birilərindən, eləcə də cəhənnəm əhli bir-birilərindən alacaq.

---

[76] Müəllif burada yeddi şeyi istisna etmişdir. Bəziləri bura həm də "ucbuz-zənəb"i də əlavə edirlər və bu, insanın onurğa sütununun ən sonuncu fəqərəsidir. İmam İbn əl-Qayyim bunları "ən-Nuniyyə" qəsidəsində zikr etmişdir və bunların arasında həm də huriləri də qeyd edib. Bu barədə əs-Suyuti'nin nəzmi də mövcuddur. Daha geniş məlumat üçün Şeyx Əhməd bin İbrahim bin İsa'nın "Təvdih əl-Məqasid va Təshih əl-Qavaid fi Şərh Qasidətil-İməm İbn əl-Qayyim" adlı kitabına (1/95-97) baxın!

## (İxlas və qədərdən razı qalmaq)

**[53]** İxlaslı əməl Allah üçündür.

**[54]** Allahın qədərinə razı qalmaq[77], Allahın hökmünə səbr etmək, Allahın – Azzə va Cəllə - dediklərinə iman gətirmək, Allahın qədərlərinin hamısına, xeyirlisinə və şərlisinə, şirininə və acısına iman gətirmək; Allah qullarının nə edəcəklərini və hansı istiqamətdə seyr etdiklərini bilir. Onlar Allahın elmindən kənara çıxa bilməzlər. Yerlərdə və göylərdə yalnız Allahın – Azzə va Cəllə - bildiyi bir şey ola bilər. Bilirsən ki, sənin başına gələn səndən yan keçməyəcəkdi, səndən yan keçən isə sənin başına gəlməyəcəkdi.[78] Allah ilə birlikdə başqa bir yaradıcı yoxdur.

***

[77] Baş verən müsibətlərə səbr etmək ilə həmin müsibətlərdən razı qalmaq arasında fərq vardır. Səbr etmək alimlərin ittifaqı ilə vacibdir, lakin razı qalmağın haqqında alimlər ixtilaf ediblər. Şeyxul-İslam İbn Teymiyyə "Minhəcus-Sunnə" kitabında (3/204) deyir: "Kasıblıq, xəstəlik və səfillik kimi haldan razı qalmaq haqqında insanların görüşləri fərqlənib; bu müstəhəbdir yoxsa vacibdir? Bu barədə Əhmədin və başqasının məzhəbində iki görüş vardır. Alimlərin əksəriyyətinə görə belə şeylərdən razı qalmaq müstəhəbdir, vacib deyildir..." İbn Teymiyyənin sözlərindən anlaşılan budur ki, o da alimlərin əksəriyyəti kimi bunun müstəhəb olduğunu deyir. Məşhur təfsirçi əl-Qurtubi və əl-Hafiz İbn Hacər'in sözlərindən anlaşılan isə bunun vacib olmasıdır. İstənilən halda bu məsələdə hər iki tərəf Quran və sünnətdən dəlillər gətirir. İbnul-Qayyim – rahmətullahi aleyhi – "Mədaricus-Səlikin" kitabında (1/105) hər iki görüşü zikr etdikdən sonra bunu vacib sayanların dəlillərinə müxtəsər şəkildə cavab vermişdir.

[78] Bu cümlənin mənası budur ki, əgər Allah sənin qədərinə bir şeyi yazıbsa, o mütləq sənin başına gələcək və onun səndən yan keçməsi mümkün deyildir. Əgər Allah sənin qədərinə bir şeyi yazmayıbsa, o mütləq səndən yan keçəcək. Yəni səndən yan keçməli olan şey heç bir zaman sənin başına gəlməz. Kim bunun əksini etiqad edərsə Allahdan başqa yaradanın olduğunu iddia etmiş olur və bu da özlüyündə şirk və küfrdür.

**[55]** Cənazə üzərindəki təkbirlərin sayı dörddür və bu, Malik bin Ənəs, Sufyan əs-Səvri[79], əl-Həsən bin Saleh[80], Əhməd bin Hənbəl və fəqihlərin görüşüdür. Bu şəkildə Allahın elçisi – salləllahu aleyhi va səlləm – söyləyib.

***

**[56]** Hər bir yağış damlası ilə göydən enən bir mələyin olduğuna iman etmək; Allahın – Azzə va Cəllə - əmr etdiyi yerə (yağış damlasını) yerləşdirir.[81]

---

[79] Əbu Abdilləh Sufyan bin Said bin Məsruq əs-Səvri İslam imamlarından və abidlərindən biridir. Hicri 161-ci ildə vəfat edib.

[80] əl-Həsən bin Saleh bin Huyey əl-Həmədani məşhur İslami alimidir. Kufənin fəqihi və abididir. Hicri 100-cü ildə anadan olub və 167-ci ildə vəfat edib.

[81] Bu, əl-Həkəm bin Uteybə və əl-Həsən əl-Basri kimi məşhur tabiin imamlarından gəlmişdir. Bunu İbn Cərir ət-Tabəri təfsirində, Əbuş-Şeyx "əl-Azamə" kitabında, İbn Kəsir "əl-Bidəyə van-Nihəyə" kitabında həsən isnad ilə rəvayət ediblər.

## (Ölülər eşidir)

**[57]** Peyğəmbər – salləllahu aleyhi va səlləm – Bədr günü quyudakı (müşriklərin ölüləri) ilə danışdıqda müşriklərin onun sözlərini eşitdiyinə iman etmək.[82]

[82] Ölülərin dirilərin danışığını və səslərini eşitməsi məsələsi alimlərin üzərində ixtilaf etdikləri məsələlərdən biridir. Alimlərin böyük əksəriyyətinə görə ölülər diriləri mütləq şəkildə eşidirlər, yəni bu eşitmə yalnız xüsusi bir hala və ya xüsusi bir səsə aid deyildir. Bu barədə hənbəli məzhəbində iki görüş vardır: Birinci görüş əl-Qadi Əbu Yalə və İbnul-Cəuzi'nin görüşüdür ki, onlara görə ölülər eşitməz. İbn Rəcəb "Əhvalul-Qubur" adlı kitabında (səh: 133) deyir: "Ölülərin dirilərin danışığını eşitməsini rədd etməkdə Aişə ilə alimlərdən bir qrup razılaşmışdır. Əshabımızdan əl-Qadi Əbu Yalə ona aid olan "əl-Cami'u-l-Kəbir" kitabında bu görüşü üstün saymışdır." İmam İbn Muflih "əl-Furu" kitabında (3/415) deyir: "İbnul-Cəuzi "əs-Sirru-l-Məsun" kitabında deyir: "Quran və düşüncənin vacib etdiyi budur ki, ölü eşitmir və hiss etmir." Məzhəbdəki ikinci görüş ümmətin alimlərinin əksəriyyətinə müvafiq olaraq ölülərin eşitdiyini təsdiq edən görüşdür və bu, məzhəbin məşhur görüşüdür. İbn Muflih deyir: "Ölü kəlamı eşidir. Əhməd'in Sufyan'ın hədisindən Ənəsdən eşidən biri vasitəsilə ondan mərfu olaraq (rəvayəti) vardır: "Şübhəsiz ki, əməlləriniz sizin yaxınlarınız və aşirətinizdən olan ölülərinizə ərz olunur, əgər xeyir olarsa sevinirlər, başqa cür olduqda isə deyirlər: "Allahım! Bizə hidayət etdiyin kimi onlara da hidayət etmədən onları öldürmə!" Bunu Əbu Davud və ət-Tayəlisi "əl-Müsnəd"ində Cabir'dən mərfu olaraq rəvayət edib və bu, zəifdir. Əhməd dedi: "Cümə günü fəcrdən sonra günəş çıxmadan öncə ziyarət edəni (ölü) tanıyır." "əl-Ğunyə" kitabında (Şeyx Abdul-Qadir əl-Ceyləni deyir) : "Bütün vaxtlarda tanıyır, amma bu vaxt daha dəqiqdir." İlk dövr əshabımızdan Əbu Muhamməd əl-Bərbəhari isə (ölünün) onu tanıdığını qeydsiz şəkildə söyləmişdir." ("əl-Furu", 3/415) Bu görüş həm də Şeyxul-İslam İbn Teymiyyənin və İbnul-Qayyimin görüşüdür.

## (Əziyyətə görə əcr vardır)

**[58]** Bir nəfər xəstələndikdə Allahın ona xəstəliyinə görə əcr yazdığına[83] iman etmək. Şəhidə isə öldürməsinə görə əcr yazır.

***

**[59]** Dünyada uşaqlara bir şey baş versə ağrı hiss etdiklərinə iman etmək. Bu isə ona görədir ki, Bəkr bin Uxti Abdil-Vahid[84] – "ağrı hiss etmirlər" dedi[85] və yalan danışdı.

---

[83] Allahın Elçisi – salləllahu aleyhi va səlləm – deyir: "Əziyyətə düçar olmuş elə bir müsəlman yoxdur ki, ağacın yarpaqları töküldüyü kimi Allah da ondan günahlarını təmizləməsin." Bu hədisi əl-Buxari (5667) və Muslim rəvayət edir. Bu mövzu ilə bağlı bəzi məsələlər vardır. Birinci: Bu cür müsibətlər və əziyyətlər hər növ günahı təmizləyə bilir yoxsa yalnız kiçik günahları təmizləyir? Bu barədə əl-Hafiz İbn Hacər – rahmətullahi aleyhi – deyir: "(Hədisin) zahiri ümumən bütün günahlara aid olmasını ifadə edir, lakin alimlərin əksəriyyəti bunu kiçik günahlara xas ediblər." ("Fəthul-Bari", 13/14) Alimlər arasında məşhur olan görüş budur ki, yalnız kiçik günahlar təmizlənir. İkinci: Hədislərdən anlaşılan budur ki, bu cür müsibətlər yalnız günahları təmizləmir, hətta savab verir və insanın dərəcəsini artırır. Bu barədə alimlər öz aralarında ixtilaf ediblər. Onlar xəstəliyin insanın günahları üçün kəffarə olmasında ittifaq etdikləri halda dərəcələrin yüksəlməsi, savabın qazanılmasının xəstəliyin özünə görə yoxsa xəstəlik baş verdikdə müsəlmanın səbr etməsinə görə baş verməsində ixtilaf ediblər. əl-Qurtubi, İzzud-Din bin Abdis-Sələm, Şeyxul-İslam İbn Teymiyyə, əl-Hafiz İbnul-Qayyim və bir çox başqa alimlərə görə müsibətlər, xəstəliklər, əziyyətlər yalnız edilmiş günahlara görə verilən cəzadır ki, Allah bu cəza ilə insanı günahlarından təmizləyir. Lakin insan buna görə savab qazanmır və dərəcəsi artmır, çünki savab yalnız kəsb yolu ilə olur, yəni insan bunu öz əməli ilə qazanır, mücərrəd müsibətin baş verməsinə görə qazanmaz. Bu görüş böyük səhabi Abdullah bin Məsuddan səhih olaraq rəvayət edilib. Şihəbud-Din əl-Qarafi, İmam ən-Nəvəvi, əl-Hafiz İbn Racəb, əl-Hafiz İbn Hacər və başqa alimlərə görə mücərrəd müsibətin böyüklüyünə uyğun olaraq günahlar təmizlənər və əgər səbr edərsə kəffarəsi də tezləşər və böyüyər. əl-Hafiz İbn Hacər "Fəthul-Bari" kitabında məsələni ətraflı müzakirə edib.

## (Allah zülm etməz)

**[60]** Bil ki, Allahın rəhməti olmadan heç kimsə Cənnətə girə bilməz. Allah hər kəsə yalnız günahlarına görə əzab verir və günahları miqdarında əzab verir. Əgər Allah səmaların əhlinə və yerlərin əhlinə, xeyirxahına da, facirinə də əzab edərsə onlara zülm etmədən əzab etmiş sayılır,[86] Allaha –

---

[84] Bəkr bin Uxti Abdil-Vahid bin Zeyd əl-Basri zühd əhlindən olub. İbn Həzm əz-Zahiri onu xavariclər sırasında zikr edib. İbn Həzm onun görüşləri arasında bunu da zikr edir ki, ona görə hər kiçik günahı edən, misal üçün zarafat məqsədilə xəfif yalan danışan belə kafir, müşrik olur və cəhənnəmə düşəcək. Lakin Bədr əhlindən olan hər hansı bir kəs günah edərsə kafir, müşrik olur, lakin Cənnətə düşəcək.

[85] əl-Hafiz İbn Hacər "Lisənul-Mizən" kitabında (2/358-359) deyir: "Onun tələbəsi Abdullah bin İsa deyərdi: "Dəlilər, uşaqlar və heyvanlar başlarına gələn xəstəliklər/səbəblər üzündən ağrı çəkmirlər, çünki Allah heç kəsə zərrə qədər də zülm etməz. İbn Quteybə isə bu ağrılar məsələsini Bəkrin özündən nəql edir." Görünür ki, bu görüş həm Bəkrə, həm də onun tələbəsi Abdullah bin İsaya aiddir və bu görüşün batilliyində heç bir şəkk yoxdur.

[86] Müəllifin bu sözləri Ubey bin Kəb'in peyğəmbərdən – salləllahu aleyhi va səlləm – rəvayət etdiyi hədisində keçir: "Əgər Allah səmaların və yerin əhlinə əzab edərsə (and olsun ki,) onlara zülm etmədən əzab edər. Əgər rəhm etsə Onun onlara rəhməti onlara öz əməllərindən daha xeyirli olar." Bu hədisi Əbu Davud (4699), İbn Macə (77) və İbn Hibban "əs-Sahih" əsərində (2/505; rəqəm: 727) rəvayət edib. Müəllif bu hədisdən anladığı mənanı burada bizlərə nəql etmişdir, lakin onun təfsirinin zahiri müşküldür. Bu məsələ ümumən qədər mövzusu ilə bağlıdır və Şeyxul-İslamın dediyi kimi bunda bir çox elm əhli xəta edib. O, deyir: "Bu mövzuda bir çox ayaqlar sürüşüb, bir çox beyinlər çaşıb, belə ki, qədəri isbat edən kəlam əhlindən olan başqa alimlər fərqli görüş irəli sürərək dedilər: "Zülmün bir həqiqəti yoxdur ki, mövcud olması mümkün olsun, əksinə o, özlüyündə mümkün olmayan işlərdəndir. [Allahın] ona qadir olduğunu və "onu Öz ixtiyarı və Öz istəyi ilə tərk etdiyini" demək olmaz. Bu sadəcə olaraq iki zidd tərəfi bir arada toplamaq kimi bir şeydir...yoxsa zehnlərdə təqdir edilən, mövcud olması mümkün olan və Allahın qadir olduğu şeylərə gəldikdə isə, onların heç biri zülm deyildir; bunu etmiş olması ilə etməmiş olması arasında bir fərq yoxdur." Malik, əş-Şafi, Əhmədin əshabından və digərlərindən [qədəri] isbat edən bir qrup fəqihlər və hədis əhli bu görüşü onlardan qəbul etdilər, həmçinin hədis şərh edən alimlər də [bu görüşü qəbul etdilər] və bu hədisi (yəni Allahın "Mən öz nəfsimə zülmü haram etdim" sözlərini) bu görüş əsasında təfsir etdilər. Ola bilər ki, [sələfdən] rəvayət edilmiş sözlərin zahirinə dayanıblar, necə ki, rəvayət etdi ki, İyəs bin Muaviyə deyib: "Qədərilərdən başqa heç kəslə tamamilə əql ilə münazirə etmədim və onlara dedim: "Zülm nədir?" Dedilər: "Sənə

Təbarakə va Təalə - "O, zülm edir" – demək olmaz, çünki yalnız özünə aid olmayan bir şeyi götürən zülm edər. Yaradılmışlar və onların hökmü Allaha – Cəllə Sənəuhu – aiddir. Yaradılmışlar onun yaratdıqlarıdır, dünya evi onun evidir, yaratdıqları ilə nə etdiyinə dair heç kəs bir şey soruşa bilməz və "nə üçün?", "necə?" sualları verilməz. Heç kimsə Allah ilə yaratdıqları arasına girə bilməz.

---

aid olmayan şeyi götürmək və ya sənə aid olmayan şey ilə təsərrüf etməkdir." Dedim: "Hər şey Allaha aiddir." İyəs'in bu sözünün məqsədi sadəcə olaraq onlara izah etməkdir ki, baş verən təsərrüflər Öz mülkü ilədir və onların öz təriflərinə əsasən bu, heç cür zülm olmaz. Bu isə haqqında qədəri isbat edənlər arasında ixtilaf olmayan bir məsələdir, belə ki, onlar qədərə iman gətirənlərlə birlikdə ittifaq edirlər ki, Allahın etdiyi hər bir şey ədalətdir." Şeyxul-İslam İbn Teymiyyə bunu izah etdikdən sonra bu barədə bir hədisi zikr edir və yenə İyəs bin Muaviyənin sözlərini mucməl şəkildə təfsir edir. Daha sonra isə yuxarıdakı hədisin izahına gələrək deyir: "Zülmü rədd edən bu dəlillər isbat edir ki, [Allahın] cəzasında ədalət olacaq və əməl sahibi öz əməlini azaltmamalıdır. Allahın əzab verdikləri kəslər haqqında dediyi sözlər də bunun kimidir: "Biz onlara zülm etmədik, lakin onlar özləri özlərinə zülm etdilər. Allahdan qeyri ibadət etdikləri ilahları Rəbbinin əmri gəldikdə onlara heç bir fayda vermədi." (Hud, 101) Həmçinin deyir: "Biz onlara zülm etmədik, lakin onlar özləri zalım idilər." (əz-Zuxruf, 76) Bəyan edir ki, cinayətkarların cəzası günahları qarşılığında ədalətdir, yoxsa "onlara zülm etdik və heç bir günah olmadan onlara cəzalandırdıq" mənasını vermir. "əs-Sünən"dəki "Əgər Allah səmaların və yerin əhlinə əzab edərsə (and olsun ki,) onlara zülm etmədən əzab edər. Əgər rəhm etsə Onun onlara rəhməti onlara öz əməllərindən daha xeyirli olar" hədisi də bəyan edir ki, əgər əzab baş versəydi mütləq onlar buna layiq olduqları üçün baş verərdi, yoxsa heç bir günah olmadan baş verəcəyini göstərmir. Bu isə izah edir ki, günah etməmiş birini cəzalandırmaq da rədd olunmuş zülmə aiddir." (Məcmu əl-Fətəva", 18/138-144) İbn Teymiyyə xüsusilə vurğulayır ki, Allahu Təalə zülmə qadirdir, lakin ədaləti, hikməti və rəhmətinə görə zülmü tərk etmişdir. İbn Teymiyyənin görüşü və onun bu barədə gəlmiş dəlillərə verdiyi təfsir İmam əl-Bərbəhəri'nin verdiyi təfsirdən fərqlənir.

## (Əsərlərə tabe olmaq və kəlam elmini tərk etmək)

**[61]** Bir nəfərin əsərlərə tənə etdiyini, onları qəbul etmədiyini və ya peyğəmbərin – salləllahu aleyhi va səlləm – xəbərlərindən hər hansı bir şeyi inkar etdiyini eşitsən onun İslamında şübhə et! Belə ki, o, pis sözə və məzhəbə malik biridir. O, bununla yalnız Allahın elçisinə - salləllahu aleyhi va səlləm – və səhabələrinə tənə etmiş olur, çünki biz Allahı, Onun elçisini – salləllahu aleyhi va səlləm - , Quranı, xeyri və şərri, dünyanı və axirəti yalnız və yalnız əsərlər vasitəsilə tanıya bilmişik.[87] Həm də sünnətin Qurana ehtiyac duymasından çox Quran sünnətə ehtiyac duyur.[88]

**[62]** Xüsusi olaraq qədər mövzusunda kəlama dalmaq, münaqəşə və mübahisə etmək bütün firqələrə görə qadağandır, çünki qədər Allahın sirridir. Allah – Təbərakə va Təalə - qədər barəsində kəlama dalmağı peyğəmbərlərinə qadağan edib, Allahın elçisinə - salləllahu aleyhi va səlləm – qədər barəsində mübahisə etməyi qadağan edib. Həmçinin peyğəmbərin –

---

[87] Allahın elçisi – salləllahu aleyhi va səlləm – belələri haqqında bir hədisində deyir: "Çox çəkməz ki, kişi öz taxtında dirsəklənmiş halda uzanarkən ona mənim hədisimi danışacaqlar və deyəcək: "Bizimlə sizin aranızda Allahın kitabı vardır; onun içində nəyi halal görürüksə halal sayırıq, nəyi haram olaraq görürüksə haram sayırıq. Diqqət edin! Allahın elçisi nəyi haram edirsə o, Allahın haram etməsi kimidir." Bunu əd-Dərimi (587), ət-Tirmizi (2664) və başqaları rəvayət ediblər. Əhli-sünnət imamı Əhməd bin Hənbəl deyib: "Kim Allah elçisinin – salləllahu aleyhi va səlləm – hədisini rədd edərsə həlak olmağına çox qalmayıb." ("Tabəqatul-Hənəbilə", 2/15; İbn Batta, "əl-İbənə əl-Kubra", 1/97)

[88] Said bin Mənsur bunu İsa bin Yunus'dan, o da əl-Əvzai'dən, o isə Məkhuldan rəvayət edib; dedi: "Sünnətin Qurana ehtiyacından daha çox Quranın sünnətə ehtiyacı vardır." İbn Şəhin "Şərh Məzəhib Əhl əs-Sunnə" kitabında (səh: 46; rəqəm: 48) bunu Yəhya bin Əbi Kəsirdən rəvayət edir ki, o, deyib: "Sünnət Quran üzərində hökm edir, Quran sünnət üzərində hökm etmir." İbn Quteybə "Təvil Muxtəlif əl-Hədis" kitabında (səh: 199) deyir: "Bununla qəsd etmişdir ki, o, Quranı izah edir və Allahın orada nəyi qəsd etməsi barəsində xəbər verir." İmam Əhməddən onun "sünnət Quran üzərində hökm edir" sözü barəsində soruşduqda demişdi: "Bu cür deməyə cəsarət etmirəm, lakin sünnət Quranı təfsir edir, onu tərif edir və onu izah edir." Bunu ondan əl-Xatib "əl-Kifəyə fi İlmir-Rivayə" kitabında (səh: 15) rəvayət edib.

salləllahu aleyhi va səlləm – səhabələri və tabiinlər də bunu xoş görməyiblər, onu həm də alimlər və təqva əhli xoşlamayıb və hamısı qədər barəsində münaqəşə etməyi qadağan ediblər. Sənə vacib olan təslim olmaq, təsdiqləmək və iman gətirmək, bütün şeylərdə Allahın elçisinin – salləllahu aleyhi va səlləm – dediyi hər bir sözə etiqad etməkdir və bundan başqa işlərdə isə susursan.

***

**[63]** İman etmək ki, Allahın elçisi – salləllahu aleyhi va səlləm – göyə qaldırıldı, Ərşə çatdı, Allah – Təbərakə va Təalə - onunla danışdı, Cənnətə daxil oldu və atəşi gördü, mələkləri gördü və peyğəmbərlər ona göstərildi, Ərşin talvarları, Kürsini, səmalarda və yerlərdə mövcud olan hər bir şeyi ayıq halda[89] gördü. Cibril onu Buraq üzərində göyləri gəzdirərək daşıdı. Namaz ona həmin gecə fərz edildi və həmin gecə Məkkəyə geri döndü. Bu, hicrətdən əvvəl baş verdi.[90]

***

**[64]** Bil ki, şəhidlərin ruhu Ərşin altında asılmış lampalardadır, Cənnəti gəzib dolaşarlar. Möminlərin ruhları Ərşin altında, kafirlərin və facirlərin ruhları isə Bərahut'dadır[91] [və o, Siccin'də yerləşir].

---

[89] Alimlərin əksəriyyətinə görə isra və merac yuxuda deyil, ayıq halda baş verib. Həmçinin peyğəmbərimiz – salləllahu aleyhi va səlləm – bu möhtəşəm səyahəti həm ruhu, həm də bədəni ilə edib. Əhli-sünnətin məşhur görüşü budur.

[90] Alləmə Cəlalud-Din əs-Suyuti isra barəsində gəlmiş rəvayətləri bir kitab altında toplayıb və onu "əl-Əyətul-Kubra fi Şərh Qissatil-İsra" adı ilə adlandırıb.

[91] Bərahut Yəməndə, Hadraməut bölgəsindəki bir quyudur. Quyunun adının "Bərahut" olaraq oxunduğunu Yaqut əl-Həməvi "Mucəmul-Buldən" kitabında (1/405), İbnul-Huməm əl-Hənəfi "Fəthul-Qadir"də (2/506) təsbit ediblər. Kitabı təhqiq etmiş ər-Raddədi qeyd edir ki, bu barədə heç bir hədis səhih deyildir. Bəli, bu tamamilə doğrudur. Lakin sələfdən bu barədə səhih nəqllər gəlib və elm əhlindən bəziləri bunu səhih sayıblar. İbnul-Qayyim "ər-Ruh" kitabında (səh: 145) deyir: "Əbu Muhamməd İbn Həzm

**[65]** Ölünün qəbrində oturdulduğuna, Munkər və Nəkirin ondan iman və onun hökmləri haqqında soruşması üçün Allahın onun ruhunu bədəninə qaytardığına iman etmək; sonra ruhunu ağrısız çıxaracaq.

**[66]** Ölünü ziyarət edərkən ölü ziyarətçini tanıyır.[92] Allahın dilədiyi şəkildə töminə onun qəbrində nemətlər verilir, facirə isə əzab verilir.

***

---

dedi: "Bu, rafizilərin görüşündəndir." Onun dediyi kimi deyildir, əksinə bunu əhli-sünnətdən bir qrup söyləyib." İbnul-Qayyim – rahiməhullah – "ər-Ruh" kitabında ölülərin ruhlarının harada qərar tapması haqqında gəlmiş fərqli görüşləri ələ almışdır. İbnul-Qayyim bu görüşlərin içindən hər hansı bir görüşü inkar etmir, lakin bu görüşlərin əhli-sünnət alimlərinə aid olduğunu deyir və hər biri üçün dəlillərin olduğunu deyir. Ona görə bunların hamısı mümkündür, çünki insanların hallarını dəyişik olduğu üçün ruhları da fərqli-fərqli yerlərdə ola bilər. əs-Suyuti "Şərhus-Sudur" kitabını İbnul-Qayyimin sözlərini zikr edir və onları dəstəkləyir. İmam Əhmədin sözləri isə kafirlərin ruhlarının atəşdə olmasını göstərir. əl-Hafiz İbn Racəb "Əhvalul-Qubur va Əhvalu Əhlihə ilən-Nuşur" kitabında (səh: 196) deyir: "Alimlərdən bir qrup kafirlərin ruhlarının Bərahut quyusunda olması görüşünə üstünlük veriblər. Onların arasında bizim əshabımızdan əl-Qadi Əbu Yalə də yer alır və bunu "əl-Mutəməd" kitabında deyib. Bu isə Əhmədin açıq sözlərinə müxalifdir; (o, deyib ki,) kafirlərin ruhları atəşdədir." Ola bilsin ki, Bərahut quyusunun cəhənnəmin dibi ilə bir əlaqəsi vardır, necə ki, dəniz haqqında rəvayət olunub ki, onun altında cəhənnəm vardır. Doğrusunu Allah bilir!" İbn Racəbin bu izahı müəllif əl-Bərbəhəri'nin də sözlərinə uyğun gəlir, çünki o, Bərahut quyusunun Siccində olduğunu deyir, bu isə yalnız bərzəx aləminə xas bir əlaqə ilə mümkündür. Bu görüşdə olanlar üçün bəlkə də ən güclü dəlil bu barədə Həzrəti Əlidən gəlmiş səhih rəvayətdir ki, onu Abdur-Razzəq "əl-Musannəf"də (5/116; rəqəm: 9118), əl-Fəkihi "Əxbər Məkkə"də (2/43; rəq: 1110) və əl-Əzraqi "Əxbər Məkkə"də (səh: 50) rəvayət ediblər.

[92] əl-Hafiz İbn Abdil-Bərr "əl-İstizkər" kitabında (2/165) İbn Abbasdan – radiyallahu anhu – peyğəmbərin – salləllahu aleyhi va səlləm – belə dediyini rəvayət edir: "Elə bir kimsə yoxdur ki, dünyada tanıdığı mömin qardaşının qəbrinin yanından keçərək ona salam verdikdə (həmin ölü) onu tanımasın və salamına cavab verməsin." Bu hədisi elm əhlindən bəziləri tənqid etsə də təhqiq əhli yanında hədis səhihdir və sabitdir. Bunu İmam Abdullah ibn Mubarək, İbn Abdil-Bərr, Əbul-Abbas əl-Qurtubi, əl-Hafiz Abdul-Haqq əl-İşbili, İbn Teymiyyə, İbnul-Qayyim, İbn Kəsir, əl-İraqi, əz-Zubeydi, əs-Suyuti, əl-Azimabadi, əş-Şəukəni səhih sayıblar. Bu barədə gəlmiş xəbərlər o qədər çoxdur ki, İbnul-Qayyim "ər-Ruh" kitabında (səh: 10) bu barədə deyir: "Sələf bunun üzərində icma edib, onlardan gələn xəbərlər mütəvatir səviyyəsindədir ki, ölü dirinin onu ziyarət etməsini bilir və bununla sevinir." Bunun eynisini İbn Kəsir öz təfsirində (6/325) deyir. Bu rəvayətləri İbn Əbid-Dunyə "əl-Qubur", əl-Qurtubi "ət-Təzkira", İbn əl-Qayyim "ər-Ruh", İbn Racəb "Əhvalul-Qubur", əs-Suyuti "Şərhus-Sudur" kitabında toplayıb.

**[67]** Bil ki, şərr də, xeyir də Allahın qəzası və qədəri ilə olur.

***

**[68]** Tur günü Musa bin İmran ilə danışanın məhz Allah – Təbərakə va Təalə - olduğuna iman etmək; Musa Allahın danışığını səs ilə öz qulaqları vasitəsilə eşidirdi və səs Ondan idi, başqasından deyildi. Kim bundan başqa bir şey deyərsə küfr etmiş olar.

## (İnsanlar bir-birindən üstündür)

**[69]** İnsan ağlı doğum ilə verilir, hər bir insana Allahın dilədiyi qədər ağıl verilib. Səmadakı zərrə kimi insanların ağılları bir-birindən fərqlənir, biri o birindən üstündür.[93] Hər bir insandan Allahın ona verdiyi əqlə uyğun əməl tələb olunur. İnsanın ağlı insanın özü tərəfindən qazanılmır, o, sadəcə Allahın – Təbərakə va Təalə - verdiyi bir nemətdir.

**[70]** Bil ki, Allah qullarından bəzilərini digərlərinə dində və dünyada üstün etmişdir və bu, Allahın ədalətindən irəli gəlir. "(Allah) zülm etdi" və nə də "qərəzlik etdi" demək olmaz. Hər kim "Allahın möminə və kafirə göstərdiyi yaxşılıq eynidir" deyərsə o, bidət sahibidir, əksinə Allah möminləri kafirlərə, itaətkarı asiyə, məsumu isə məxzula[94] üstün qılmışdır və bu, Onun adilliyindən irəli gəlir. Bu, Allahın fəzlidir ki, dilədiyinə verir və dilədiyini ondan məhrum edir.

***

---

[93] Teymiyyə ailəsinə aid "əl-Musvaddə fi Usulil-Fiqh" kitabında (səh: 560) deyilir: "Əshabımız deyib: Bir əqlin başqasından daha kamil və daha üstün olması mümkündür. Bunu Əbu Muhamməd əl-Bərbəhəri, Əbul-Həsən ət-Təmimi və əl-Qadi zikr edib. Şeyximiz (yəni Şeyxul-İslam) dedi: "Əbu Muhamməd "Şərhus-Sunnə"də dedi: "İnsan ağlı doğum ilə verilir, hər bir insana Allahın dilədiyi qədər ağıl verilib. Səmadakı zərrə kimi insanların ağılları bir-birindən fərqlənir, biri o birindən üstündür. Hər bir insandan Allahın ona verdiyi əqlə uyğun əməl tələb olunur." Şeyximizin atası (Abdul-Həlim bin Abdis-Sələm) dedi: Əbul-Xattab və İbn Aqil isə bir əqlin digərindən üstün olmasının caiz olmaması görüşünə yönəliblər. Bu isə - əl-Qadinin nəql etdiyinə əsasən – mötəzilənin və əşarilərin məzhəbidir. Əşarilər deyiblər: "İnsanların "filankəsin ağlı filankəskindən üstündür" şəklindəki sözlərinə gəldikdə isə bu, sadəcə olaraq təcrübələrə aiddir, çünki təcrübələr əql adlana bilir." Bu, fasiddir."

[94] "Məsum" burada qorunulmuş, müdafiə olunmuş, "məxzul" isə çarəsiz, tərk olunmuş anlamına gəlir.

**[71]** Dini bir məsələdə müsəlmanlar üçün, onların həm yaxşısı, həm də günahkarı üçün nəsihəti[95] gizli saxlamağın halal deyildir. Kim gizlədərsə müsəlmanları aldatmış sayılır. Müsəlmanları aldadan isə dini aldatmış olur və dini aldadan Allaha, Onun elçisinə və möminlərə xəyanət etmiş olur.

***

**[72]** Allah – Təbərakə va Təalə - Eşidəndir, Görəndir. Eşidəndir, Biləndir. Hər iki əli də açıqdır. Allah yaratdıqlarını yaratmadan öncə onların Ona asi olacaqlarını bilirdi. Allahın elmi onların hamısına nüfuz edir. Allahın onlar haqqındakı elmi onları İslama hidayət etməsinə mane olmadı, əliaçıqlıq, səxavət və xeyirxahlıq göstərərək Allah onları İslam ilə mükafatlandırdı, beləliklə bütün həmdlər Ona aiddir!

***

**[73]** Bil ki, ölüm zamanı (ölüyə verilən) müjdənin üç növü vardır: "Ey Allahın sevimli qulu, Allahın razılığı və Cənnəti ilə müjdələn!" deyilər. Ya da "ey Allahın düşməni, Allahın qəzəbi və atəş ilə müjdələn!" deyilər. Ya da "Ey Allahın qulu, [intiqamdan][96] sonra cənnət ilə müjdələn!" deyilər. Bu, İbn Abbasın sözləridir.[97]

---

[95] Burada nəsihət bizim azərbaycan dilində istifadə etdiyimiz nəsihət sözünün mənası ilə məhdudlaşmır. Ərəb dilində nəsihət sözü daha geniş mənaya malikdir. Nəsihət xalislik, təmizlik və səmimilik ifadə edir. Nəsihət sözünün mənalarından biri xeyir diləməkdir və bu xeyir səmimi və xalis olmalıdır. Ona görə də "Din nəsihətdir" şəklində səslənən məşhur hədisdə Allaha, Kitabına, peyğəmbərlərinə, müsəlman imamlara və bütün müsəlmanlara nəsihət ifadəsi ilə qəsd olunan onlara qarşı xalis və səmimi olmaqdır. Allaha nəsihət Ona ibadətlərdə səmimi olmaqdır.

[96] Fərqli çaplarda bu söz fərqli təsbit edilib. ər-Raddədi təhqiqində bu sözü "İslam" olaraq təsbit edib. Lakin özü dipnotda qeyd edir ki, kitabın əlyazmasında bu sözün yerinə "intiqam" sözü keçir və təəccübünü bildirir. Əslində ər-Raddədi'nin nə üçün təəccüb etməsi bizi də təəccübləndirir. Əksinə "intiqam" sözünün orada yer alması daha məntiqlidir. Kitabın Abdur-Rahmən əl-Cumeyzi tərəfindən edilmiş təhqiqində isə bu söz

***

**[74]** Bil ki, Cənnətdə Allaha ilk baxanlar korlar olacaqlar[98], sonra kişilər, sonra qadınlar olacaqlar. Öz həqiqi gözləri ilə baxacaqlar, necə ki, Allahın elçisi – salləllahu aleyhi va səlləm – deyir: “Dolu ay gecəsi ayı gördüyünüz kimi Rəbbinizi də görəcəksiniz və onu görməkdə heç bir çətinlik çəkməyəcəksiniz.”[99] Buna iman gətirmək vacibdir və bunu inkar etmək küfrdür.

---

“intiqam” olaraq təsbit edilib. əl-Cumeyzi dipnotda əlavə edir ki, əlyazmalardan birində bu sözün yerinə “İslam” sözü keçir, lakin məzmuna daha uyğun olan intiqam sözüdür. Burada intiqamın mənası günahlarına görə cəhənnəmdə əzab çəkdikdən sonra Cənnətə daxil olmaqdır. Doğrusunu Allah bilir!

[97] Bax: əl-İşbili, “əl-Aqibətu fi Zikril-Məut”, səh: 118

[98] Bu, həm mərfu, həm də məvquf olaraq rəvayət olunub. Mərfu olaraq bunu əl-Hafiz əd-Deyləmi “Firdəus əl-Əxbər” kitabında (1/55) Səmura bin Cundub’dan rəvayət edir və rəvayətin sənədi zəifdir. Məvquf olaraq əl-Həsən əl-Basri’dən rəvayət olunub. Bunu ondan Hafiz əl-Laləkai “Şərh Usul İtiqadi Əhlis-Sunnə val-Cəməa” kitabında (2/578) rəvayət edir. Belə bir şeyi isə insanın öz ağlından söyləməsi mümkün deyildir, bunu səhabələrdən öyrənməsi möhtəməldir.

[99] əl-Buxari (554); Muslim (633)

## (Dindəki bidətlərin ən böyük səbəblərindən biri kəlam elmidir)

**[75]** Bil ki, - Allah sənə rəhm etsin! – dində zındıqlıq, küfr, şəkk, bidət, zəlalət və çaşqınlıq heç vaxt olmayıb, (bu şeylər) yalnız və yalnız kəlam elmi, kəlam, münaqəşə, mübahisə əhli səbəbindən ortaya çıxıb. Allahu Təalə

- "**Allahın ayələri barəsində yalnız kafirlər mübahisə edər**"[100] –

dedikdən sonra insanın münaqəşəyə, mübahisəyə, çəkişməyə cürət etməsi necə də təəccüblüdür! Sənə vacib olan əsərlərə və əsər əhlinə təslim olmaq, onlardan razı qalmaq, çəkinmək və sakit durmaqdır.

***

**[76]** Allahın – Təbərakə va Təalə - yaratdıqlarını cəhənnəmdə qandal, buxov və zəncirlərlə əzab edəcəyinə iman etmək; atəş içərilərində, yuxarılarında və altlarında olacaq. Halbuki cəhmiyyə[101] - və onların

---

[100] Ğafir, 4

[101] Hicri ikinci əsrdə ortaya çıxmış bir firqədir. Baniləri əl-Cəhm bin Safvan ət-Tirmizi olub. Kufədə yaşayıb. Dəməşqdən qaçan əl-Cad bin Dirhəm ilə qarşılaşıb və onun batil fikirlərini mənimsəmişdir. Xalid bin Abdilləh əl-Qasri hicri 105-ci ildə əl-Cad bn Dirhəmi öldürdükdən sonra əl-Cəhm bin Safvan onun fikirlərini yaymağa davam etdi. Davamçıları ortaya çıxdı və daha sonra Xorasanın Tirmiz şəhərinə qovuldu. Tirmizdə məzhəbini yaymağa davam etdi. Xorasan bölgəsinin Bəlx və Tirmiz şəhərində davamçıları çoxaldı. Əməvi dövlətinə qarşı qiyam etmiş əl-Haris bin Sureyc ət-Təmimi ilə birlikdə iştirak etdiyi üçün hicri 128-ci ildə öldürüldü.

arasında Hişəm əl-Futi[102] – deyir ki, (Allah) onlara yalnız atəşin yanında əzab verəcək. Bu isə Allahı və Onun elçisini rədd etməkdir.

---

102 Əbu Abdilləh Hişəm bin Amr əl-Futi mötəzililərin kufəli şeyxlərindən biri olub. Onun davamçılarına hişəmilər deyilir. Məşhur mötəzili alim Əbul-Huzeyl'in tələbələrindən idi. Bir çox batil görüşün sahibi olub. "Həsbunallahu va niməl-vəkil" sözünü deməyi qadağan edərdi. Ona görə Allah kafirə atəş ilə əzab etmir, yeri yağış ilə diriltmir, hidayət etmir və azdırmır.

## (Şəhadət, namaz, zəkat)

**[77]** Bil ki, fərz namazların sayı beşdir. Onları artırmaq olmaz, nə də vaxtlarında azaltma etmək olmaz. Səfərdə məğrib namazı istisna olmaqla digər namazlar iki rükətdir. Kim namazın beşdən çox olduğunu deyərsə bidət etmişdir. Beşdən az olduğunu deyərsə bidət etmişdir və Allah onları yalnız öz vaxtlarında qəbul edir. Unutma halı istisnadır, çünki üzrlüdür və xatırladığı zaman qılmalıdır. Ya da müsafir olması istisnadır, bu zaman diləsə iki namazın arasını birləşdirə bilər.

**[78]** Zəkat Allahın elçisi – salləllahu aleyhi va səlləm – dediyi kimi qızıldan, gümüşdən, meyvələr, toxumlar və heyvanlardan ödənir. Özünün paylaması caizdir, eləcə də (zəkatını) imama verməsi də caizdir.

**[79]** Bil ki, İslamın əvvəli Allahdan başqa haqq məbudun olmadığına və Muhammədin Onun qulu və elçisi olduğuna şahidlik etməkdir.

**[80]** Allahın dedikləri Onun dediyi kimidir və dediyindən dönməz. O, dediyi kimidir.

**[81]** Şəriətin hamısına iman etmək

***

**[82]** Bil ki, Kitab, İslam və sünnətin hökmünə görə satıldığı təqdirdə və araya bir dəyişdirmə və ya zülm və ya haqsızlıq və ya aldatma və ya Qurana müxalif olan bir şey və ya bilinənin ziddi olan bir şey daxil olmadığı təqdirdə müsəlmanların bazarlarında aparılan satış və alış halaldır.

## (Fitnələrdən əmin olmaq olmaz)

**[83]** Bil ki, - Allah sənə rəhm etsin! –bu dünyada yaşadığı müddətdə qulun ehtiyac və qorxu içində olması lazımdır, çünki o, bütün xeyir əməlləri etsə belə hansı halda öləcəyini, sonunun necə olacağını və Allahı hansı hal üzərində qarşılayacağını bilmir. Nəfsinə qarşı həddini aşana ölüm zamanı Allahu Təalədən ümidini kəsməməsi, Allah – Təbərakə va Təalə - haqqında gözəl zəndə olması, eyni zamanda günahlarına görə qorxması lazımdır. Əgər Allah ona rəhm edərsə bu, Allahın xeyirxahlığına görədir. Əgər ona əzab verərsə onun öz günahına görədir.

**[84]** Allahın – Təbərakə va Təalə - qiyamət gününə qədər ümmətində baş verənləri peyğəmbərinə göstərməsinə iman etmək.

**[85]** Bil ki, Allahın elçisi – salləllahu aleyhi va sələm – deyib: "Ümmətim yetmiş üç firqəyə parçalanacaq. Bir firqədən başqa hamısı atəşdədir və o firqə camaatdır." Soruşuldu: "Ey Allahın elçisi, onlar kimdir?" Dedi: "Mənim və səhabələrimin bu gün tutduqları yol"[103]

Ömərin xilafətinə qədər din bu cür idi. Osmanın zamanında da belə idi. Osman öldürüldükdə ixtilaf və bidətlər gəldi. İnsanlar qruplara böləndülər və firqələrə parçalandılar. İnsanların bir hissəsi dəyişikliklərin ilk əvvəlində haqq üzərində sabit qaldı, haqq söylədi və insanları ona dəvət etdi.

Fılankəslərin xilafəti zamanında dördüncü nəsil gələnə qədər işlər bu cür doğru olmağa davam etdi, sonra isə zaman çevrildi və insanlar çox dəyişdilər, bidətlər yayıldı. Haqqın və camaatın yolundan başqa yollara dəvət edənlərin sayı çoxaldı. Allahın elçisinin – salləllahu aleyhi va sələm – və səhabələrinin söyləmədiyi bir şeydə sınaqlar başladı. Parçalanmağa dəvət etdilər və peyğəmbər – salləllahu aleyhi va sələm – parçalanmağı qadağan edib. Bir-birilərini təkfir etdilər və hər biri öz görüşünə və onlarla

---

103 ət-Tirmizi (2640); Əbu Davud (4596); İbn Macə (3991)

razılaşmayanların təkfir edilməsinə dəvət edirdi. Buna görə də cahillər, adi insanlar, elmi olmayanlar yollarını azdılar. İnsanlara dünya işlərindən bir şeyi şirin göstərdilər və onları dünya cəzası ilə qorxutdular. İnsanlar da dünya üçün qorxduqlarına görə və dünyanı əldə etmək istədikləri üçün onlara tabe oldular, beləliklə, sünnət və sünnət əhli gözlərdən itdi. Bidət isə aşkara çıxdı və geniş yayıldı. Bilmədikləri işlərdə bir çox yöndən küfr etdilər. Qiyası uydurdular və Rəbbin ayələrindəki, hökmlərindəki, əmrindəki və qadağalarındakı qüdrətini öz ağıllarına və görüşlərinə görə yozdular. Ağıllarına uyğun olanları qəbul etdilər və ağıllarına uyğun olmayanları inkar etdilər, beləliklə İslam qəribələşdi və sünnət qəribələşdi və sünnət əhli də öz ölkələrində qəriblərə döndülər.

***

**[86]** Bil ki, mutə - qadınlarla mutə[104] - və istihləl[105] Qiyamət gününə qədər haramdır.

[104] Azərbaycanda siğə adı ilə tanınır və İslam şəriəti bunu qadağan edir.
[105] Üç dəfə boşandıqdan sonra qadını əvvəlki ərinə halal etmək üçün onunla evlənmək.

## (Haşım oğullarının fəziləti)

**[87]** Haşım oğullarının[106] fəzilətini tanı! Çünki onlar Allahın elçisinin – salləllahu aleyhi va səlləm – qohumlarıdır. Qureyşin, ərəblərin[107] və bütün qəbilə qollarının fəzilətini bilməlisən. Onların qədrini və İslamdakı hüquqlarını tanı! Bir qövmün azadlı qulu onlardan sayılır[108]. Digər insanların da İslamdakı haqlarını tanı! Ənsarların da fəzilətini, peyğəmbərin – salləllahu aleyhi va səlləm – onlar haqqındakı vəsiyyətini bilməlisən. Peyğəmbərin ailəsini də unutmamalısan! Onların fəzilətlərini tanımalısan! (Peyğəmbərin) Mədinə əhlindən olan qonşularını da! Onların da fəzilətlərini tanı!

---

[106] Haşım oğulları Haşim bin Abd Manaf'ın oğullarıdır. İslamın əvvəlində qureyşin özəyi sayılırdılar. Hişamın Abdul-Muttalib adlı oğlu var idi. Abdul-Muttalibin isə Abdullah, Əbu Talib, Həmzə, əl-Abbas və Əbu Ləhəb adlı oğulları var idi. Abdullahın oğlu isə yaradılmışların ən xeyirlisi Muhamməd idi. Salləllahu aleyhi va alə əlihi va səlləm.

[107] Ərəb cinsinin əcəm cinsindən daha fəzilətli, daha şərəfli olmasına etiqad etmək əhli-sünnətin etiqadıdır. Şeyxul-İslam İbn Teymiyyə "İqtida əs-Sirat əl-Mustəqim" kitabında (1/374-375) deyir: "Əhlus-Sunnə val-Cəməat etiqad edir ki, ərəb cinsi ibraniləri, suryaniləri, romalıları, farsları və başqaları da daxil olmaqla əcəm cinsindən əfzəldir. Qureyş isə ərəblərin ən əfzəlidir və Haşim oğulları Qureyşin ən əfzəlidir və Allahın elçisi – salləllahu aleyhi va səlləm – Haşim oğullarının ən fəzilətlisidir.O, həm də bütün yaradılmışların özü və nəsəbi baxımından ən fəzilətlisidir." Lakin bilmək lazımdır ki, bir ərəb bir başqa əcəmidən üstün deyildir. Amma bir cins kimi ərəb cinsi əcəm cinsindən üstündür.

[108] Bunu əl-Buxari (6761) Ənəs bin Malik vasitəsilə rəvayət edib ki, peyğəmbər – salləllahu aleyhi va səlləm – deyib: "Qövmün azadlı qulu onlardandır."

## (Cəhmiyyə firqəsi)

**[88]** Bil ki, - Allah sənə rəhm etsin! – elm əhli hər zaman cəhmiyyənin sözlərini rədd ediblər, ta ki, fılankəslərin[109] xəlifəliyi zamanı alçaq və dəyərsiz kimsələrin insanların işi haqqında danışdıqları vaxt gəldi, onlar peyğəmbərin – salləllahu aleyhi va səlləm - əsərlərinə tənə etdilər, qiyas və rəyə əsaslandılar. Onlarla razılaşmayanları təkfir etdilər və onların bu sözlərini cahillər, düşüncəsizlər və elmsiz kəslər qəbul etdi, elə bir həddə çatdı ki, bilmədikləri halda küfr etdilər. Ümmət bir çox yöndən həlak oldu, bir çox yöndən küfr etdi, bir çox yöndən zındıqlıq etdi, bir çox yöndən yollarını azdılar. Bir çox yöndən parçalandılar və bidətlər çıxardılar, yalnız Peyğəmbərin – salləllahu aleyhi va səlləm – sözü, onun əmri və səhabələrinin əmri üzərində sabit qalan, səhabələrdən heç kəsi xətada ittiham etməyən, onların getdikləri yollarından ötə bir həddi aşmayan[110], onların kifayətləndikləri ilə kifayətlənənlər, onların yolları və məzhəblərindən üz döndərməyən, səhabələrin səhih İslam, səhih iman üzərində olduğundan əmin olan müstəsna oldu. Dinində səhabələri təqlid etdi və rahatlıq tapdı və dinin yalnız təqlid ilə yaşandığından əmin oldu. Təqlid isə Muhammədin – salləllahu aleyhi va səlləm – səhabələrini təqlid etməkdir.

**[89]** Bil ki, hər kim "Quran ilə ləfzim məxluqdur"[111] deyərsə bidətçidir[112]. Susan və məxluq olduğunu və ya olmadığını deməyən isə cəhmidir. Bunu bu

---

[109] Əlyazmaların birində "Bənu əl-Abbas" sözü keçir, yəni abbasilərin xilafəti qəsd olunur.

[110] Səhabələrin hidayəti ilə kifayətləndilər, artıq danışaraq onların tərk etdikləri yolda həddi aşmadılar.

[111] Bu söz həm doğru, həm də batil məna ifadə edə bilər və bu, sözü işlədənin qəsdindən asılıdır. Bu sözü ilk dəfə ortaya çıxaranlar cəhmilər və mötəzililər olublar. Onlar açıq şəkildə Quran məxluqdur deməkdən çəkindikləri üçün bu söz ilə adi xalq kütləsinin etiqadına çirkin sözlər qatmaq istəyirdilər. "Quran ilə ləfzim məxluqdur" sözü ilə cəhmilər dilləri ilə tələffüz etdikləri sözlərin məxluq olduğunu qəsd edirdilər və bu, Quranın özünün məxluq olması anlamına gəlir. Lakin bu sözlə həm də insanın tələffüz

şəkildə Əhməd bin Hənbəl deyib.[113] Allahın elçisi – salləllahu aleyhi va səlləm – deyir: "Aranızdan məndən sonra yaşayanlar çoxlu ixtilaf görəcək. Sonradan uydurulmuş işlərdən uzaq durun! Çünki onlar zəlalətdir. Mənim

---

etdiyi səslərin məxluq olması da qəsd oluna bilər ki, bu, doğru mənadır. Bu fitnənin qarşısını almaq üçün başlarında İmam Əhməd bin Hənbəl olmaqla bir çox imam bu cür söz işlədənlərin cəhmi və bidətçi olduğunu söyləyib və insanları onlardan uzaqlaşdırıb. Şeyxul-İslam İbn Teymiyyə "Dar'u Təarud əl-Aql van-Nəql" kitabında (1/260-262) deyir: "Onlar belə deməyə başladılar: "Endirilmiş və eşidilən bu Quran əslində Quranın tilavətidir, qiraətidir və Quranın tilavəti məxluqdur və Quranın qiraəti məxluqdur. Onlar deyirlər: "Quranla etdiyimiz tilavət məxluqdur. Quranla etdiyimiz qiraət məxluqdur." Eşidilən kəlamı da bura daxil edirdilər və deyirdilər: "Quranla ləfzimiz (tələffüzümüz) məxluqdur" və bura tələffüz olunan, tilavət edilən və eşidilən Quranı da daxil edirdilər. İmam Əhməd və digər sünnət imamları bunu inkar etdilər və dedilər: "Ləfzilər cəhmidirlər." Dedilər: "Cəhmilər üç qrupa ayrıldılar: bir firqə dedi: Quran məxluqdur. Digər firqə dedi: Susuruq. Nə "Quran məxluqdur" demirik, nə də "Quran məxluq deyildir" demirik. Digər firqə isə dedi: "Quranın tilavəti və Quran ilə tələffüz məxluqdur." Bu, əhlus-sunnətdə yayıldıqda bir qrup xəta etdi və dedi: "Quranla etdiyimiz tələffüz məxluq deyildir və onunla etdiyimiz tilavət məxluq deyildir." İmam Əhməd bunları da bidətdə ittiham etdi və tərk edilmələrini əmr etdi. Buna görə də əl-Əşari "əl-Məqalət" kitabında bunu əhlus-sunnə və hədis əhlindən nəql etmiş və demişdir: "Ləfz görüşü və bu barədə susmaq onlara görə bidətdir. Kim "Quran ilə tələffüz məxluqdur" deyərsə o, onlara görə bidətçidir və kim desə ki, "məxluq deyildir", o da bidətçidir." Eynilə Muhamməd bin Cərir ət-Tabəri "Sarih əs-Sunnə" kitabında zikr edir ki, o, bir-çox şeyxindən İmam Əhmədin belə dediyini eşitmişdir: "Kim "Quran ilə tələffüzüm məxluqdur" deyərsə cəhmidir və kim "o, məxluq deyildir" deyərsə bidətçidir." Əbu Muhamməd bin Quteybə bu barədə bir kitab yazıb. Əbu Bəkr əl-Xalləl bunu "əs-Sunnə" kitabında ələ alıb və bu barədə geniş söhbət açıb. Orada Əbu Bəkr əl-Mərruzi'nin bu barədə yazdığı kitabını da zikr edir...Hədis əhli bu məsələdə parçalanmışdı. Beləliklə onlardan bir qrup belə deyirdi: "Quranla tələffüzümüz məxluq deyildir." Qəsd etdikləri bu idi ki, (qulaqla) eşidilən Quran məxluq deyildir, qəsd etdikləri insanın səsi deyildi. Necə ki, bu, Əbu Hatim ər-Razi, Muhamməd bin Davud əl-Missisi və bunlardan başqa alimlərin görüşü idi. Bunların tələbələri arasında elələri də var idi ki, ola bilsin ki, insanın səsini və ya felini də bura daxil edirdi və ya bu barədə susurdu. Bəzi imamlar bunu anladılar və onları rədd etmək üçün belə deməyə başladılar: "İnsanların felləri, səsləri məxluqdur." Necə ki, bunu əl-Buxari, Muhamməd bin Nasr əl-Mərvazi və elm və sünnət əhlindən olan başqa alimlər etmişdi. Beləliklə bu məsələyə çoxca qarışmaq səbəbilə müştərək mənalı sözlər və nəfsi istəklər ortaya çıxmağa başladı. Bunun üzündən bir növ parçalanma və fitnə əmələ gəldi. əl-Buxari ilə Muhamməd bin Yəhya əz-Zuhli arasında məşhur olan hadisə baş verdi və Muslim bin əl-Həccəc kimi alimlərdən ibarət bir qrup əl-Buxarini dəstəklədi. Əbu Zura ər-Razi və Əbu Hatim ər-Razi və başqaları ona qarşı çıxdılar." Şeyxul-İslamın verdiyi izaha əsasən anlayırıq ki, hədis əhlinin ən böyük imamları etiqadda eyni görüşdə olsalar da aradakı söz fərqlərinə görə ixtilafa düşmüşdülər.

[112] Əlyazmaların birində "cəhmidir" sözü keçir.

[113] Bax: əs-Sabuni, "Aqidətus-Sələf va Əshəbul-Hədis" (səh: 171 - ...), əl-Beyhəqi, "əl-İtiqad" (səh: 110), əl-Laləkai, "Şərh Usul İtiqad Əhl əs-Sunnə" (1/177), İbn Batta, "əl-İbənə" (səh: 87), Abdullah bin Əhməd, "əs-Sunnə", (1/179, 279-280)

sünnətimə və doğru yolda olan adil xəlifələrimin sünnətinə tabe olun! Azı dişləriniz ilə onu dişləyin!"[114]

**[90]** Bil ki, cəhmiyyənin həlak olmasının yeganə səbəbi onların Allah haqqında düşünməkləri, "nə üçün?" və "necə?" suallarını araya qatmaqları, əsərləri tərk etmələri, qiyası icad etmələri oldu və dini öz rəylərinə qiyas etdilər, beləliklə elə bir aşkar küfr ilə gəldilər ki, küfr olması gizli deyildir. Digər insanları kafir saydılar. Bu işləri onları elə bir hala gətirdi ki, artıq tətilə etiqad etdilər[115].

Alimlərdən bəziləri – və onların arasında Əhməd bin Hənbəl də - radiyallahu anhu – yer alır – dedi ki, cəhmi kafirdir, qiblə əhlindən deyildir, qanı halaldır, miras almaz və ondan miras alınmaz[116], çünki onlar deyirlər ki, "cümə namazı, camaat namazı, bayram namazları və zəkat yoxdur" və deyirlər ki, "kim - Quran məxluqdur - demirsə kafirdir". Muhamməddin – salləllahu aleyhi va səlləm - ümmətinə qarşı qılınc qaldırmağı halal gördülər, özlərindən əvvəlkilərə müxalif oldular, Allahın elçisinin – salləllahu aleyhi va səlləm – və səhabələrindən heç kimsənin demədiyi bir

---

[114] Əbu Davud (4607); İbn Macə (42); ət-Tirmizi (2676); İbn Hibban (1/178-179; rəq: 5)

[115] Tətilə etiqad etmək bir şeyi boş çıxarmaqdır. Cəhmilər Allahın həm adlarını, həm də sifətlərini inkar etdilər. Allahın qüdrətinin, elminin, iradəsinin olmadığını, Allahın görmədiyini və eşitmədiyini dedilər. Onlara görə Allahın elmi, iradəsi, qüdrəti Onun vəsfləri deyil, Onun özüdür. Beləliklə Allahı bir heç etdilər, çünki adı və vəsfi olmayan bir şey həqiqətdə bir heçdir.

[116] Bir çox alim cəhmiləri qiblə əhlindən saymayıb. Əbu Said Osman bin Said əd-Dərimi "ər-Raddu aləl-Cəhmiyyə" kitabında (səh: 171-180) bağdadlı biri ilə münazərəsini xatırlayaraq onun sualına cavab surətilə cəhmiləri nə üçün təkfir etdiyini izah edir və bunun üçün dəlilləri zikr edir. Sonra cəhmiləri təkfir edən alimlərin adlarını qeyd edir və qeyd etdiyi alimlərin arasında Səlləm bin Əbi Muti, Həmməd ibn Zeyd, Yezid bin Harun, İbn əl-Mubarək, Vaki, Əbut-Təubə ər-Rabi bin Nəfi'ni zikr edir. Cəhmiləri kafir sayanlar arasında əl-Buxari da yer alır. O, "ər-Raddu aləl-Cəhmiyyə va Əshəbit-Tatil" adlı kitabında (2/24) deyir: "Yəhudilərin, nəsranilərin və məcusilərin sözlərinə baxdım, lakin onlardan (cəhmilərdən) küfrlərində daha sapıq olanını görmədim. Mən onları təkfir etməyənlər arasında onların küfründən xəbərdar olmayanlardan başqalarını cahil sayıram." Daha sonra isə (2/33) deyir: "Mənim üçün cəhmi və rafizinin arxasında namaz qılmaq ilə nəsrani və yəhudinin arxasında namaz qılmaq arasında bir fərq yoxdur. Onlara salam verilməz, (xəstələri) ziyarət edilməz, onlarla evlənməzlər, onları şahid kimi istifadə etməzlər və kəsdikləri yeyilməz." Onu da qeyd etməliyik ki, burada cəhmiyyə ilə qəsd olunan xalis cəhmi olan kəslərdir, çünki bəzi alimlər cəhmilərin bəzi görüşlərini mənimsəyə bilərlər, amma bu, onları cəhmi etmir. Üstəlik onu da əlavə etməliyəm ki, heç də bütün alimlər cəhmiləri qiblə əhlindən kənarlaşdırmaq görüşü ilə razılaşmır. Hənəfi və şafi'i üləması arasında məşhur olan görüş budur ki, bidətçi firqələrdən heç biri təkfir olunmaz.

şey ilə insanları sınağa çəkdilər. Məscidləri və camiləri boşaltmaq istədilər, İslamı zəiflətdilər, cihadın tərk olunmasına səbəb oldular, (müsəlmanların) parçalanması üçün çalışdılar, əsərlərə müxalif oldular, mənsux olan dəlillərlə danışdılar, mütəşabihləri dəlil gətirdilər, insanların öz etiqadlarında, öz dinlərində şəkk etmələrinə səbəb oldular. Rəbləri haqqında münaqəşə etdilər və dedilər: "Qəbr əzabı, (peyğəmbərin) hovuzu və şəafəti yoxdur, Cənnət və Atəş hələ də yaradılmayıb, peyğəmbərin – salləllahu aleyhi va səlləm – dediyi çox şeyi inkar etdilər. Onların təkfirini və qanlarını halal sayanlar bu baxımdan bunu halal sayıblar, çünki kim Allahın Kitabından bir ayəni rədd edərsə Kitabın hamısını rədd etmiş olur və kim peyğəmbərin – salləllahu aleyhi va səlləm – bir əsərini rədd edərsə əsərlərin hamısını rədd etmiş olur. Belə biri Əzəmətli Allaha qarşı kafirdir. Beləliklə onlar bir müddət belə davam etdilər və bu işlərində sultandan kömək tapdılar. Bu işləri üçün qılınc və qamçını işə saldılar. Sünnət və camaat elmi itməyə başladı, bu iki elmi zəiflətdilər və bidətin, onun haqqında söhbətlərin aşkara çıxması və (bidətçilərin) saylarının çox olması səbəbilə bu iki elm gizlədilmiş oldu. Məclislər qurdular, görüşlərini aşkara çıxardılar, bu barədə kitablar yazdılar, insanları şirnikləşdirdilər və (insanlar) onların rəhbər olmasını istədi. Böyük bir fitnə idi, Allahın qoruduğundan başqa heç kimsə ondan qurtula bilmədi. İnsanın onların məclislərindən təsirləndiyi ən xəfif şey öz dinində şəkk etməsi və ya onların yolunu izləməsi və ya onların haqq üzərində olduğunu iddia etməsi oldu. Özünün haqq yoxsa batil üzərində olduğunu bilmədiyi üçün şəkk edirdi. Beləliklə əl-Mutəvəkkil adı ilə çağırılan (xəlifə) Cafərin[117] zamanı gələnə qədər xalq həlak olmuşdu. Allah onun vasitəsilə bidətləri söndürdü, onun vasitəsilə haqqı aşkara çıxartdı və əhli-sünnəti onun vasitəsilə üstün qıldı və bu günə qədər saylarının az olmasına və bidət əhlinin sayının çox olmasına baxmayaraq əhli-sünnətin dili uzandı. Onlardan bir qrup qaldı ki, prinsipləri və zəlalətin əlamətləri ilə əməl edir, insanları ona doğru çağırırlar. Onlara mane olan bir kəs, onları dediklərindən və etdiklərindən saxlayan bir kimsə yoxdur.

[117] Əbul-Fədl Cafər bin Muhamməd bin Harun ər-Raşid abbasi xəlifələrindən biri olub. Hicri 205 və ya 207-ci ildə doğulub. Qardaşı əl-Vasiq 232-ci ildə öldükdə ona beyət etdilər.

***

**[91]** Bil ki, bidət yalnız hər bir qara-qışqırıq salan kəsə tabe olan cahil tör-töküntü insanlardan çıxıb, hər əsən küləyə əyilirlər. Bu cür olan bir kəsin dini yoxdur. Allah – Təbərakə va Təalə - deyir:

“**Onlar yalnız özlərinə elm gəldikdən sonra aralarındakı həsəd üzündən ixtilafa düşdülər.**”[118]

Yenə deyir:

**“Onlar yalnız özlərinə elm gəldikdən sonra aralarında ədavət üzündən ayrılığa düşdülər.”[119]**

Deyir:

“**Halbuki (kitab) verilmiş şəxslər özlərinə açıq-aydın dəlillər gəldikdən sonra aralarındakı nifrət üzündən ixtilafa düşdülər.**”[120]

Belələri şərr alimlər, tamah və bidət sahibləridirlər.

---

[118] əl-Casiyə, 17
[119] əş-Şura, 14
[120] əl-Bəqara, 213

## (Hər zaman bir firqə haqq üzərində olacaq)

**[92]** Bil ki, insanların arasında həmişə haqq və sünnət üzərində olan bir qrup olacaq, onlara Allah doğru yolu göstərəcək və onlar vasitəsilə də başqalarına doğru yolu göstərəcək, onlar vasitəsilə sünnətləri dirildəcək. Onlar ixtilaf çıxdıqda sayları az olmaqla birlikdə Allahın vəsf etdiyi kəslərdir; dedi:

“**Halbuki (kitab) verilmiş şəxslər özlərinə açıq-aydın dəlillər gəldikdən sonra aralarındakı nifrət üzündən ixtilafa düşdülər.**”

Bundan sonra onları istisna edərək dedi:

“**Allah isə Öz icazəsi ilə iman gətirənləri ixtilafda olduqları (məsələlərdə) haqq yönəltdi. Allah istədiyini düz yola yönəldər.**”

Allahın Elçisi – salləllahu aleyhi va səlləm – deyib: “Ümmətimdən həmişə bir qrup haqq üzərində olmağa davam edəcək, Allahın əmri gələnə qədər onları tərk edənlər onlara bir zərər verə bilməyəcəklər.”[121]

***

**[93]** Bil ki, - Allah sənə rəhm etsin! – elm çoxlu rəvayət etmək və çox kitab yazmaq deyildir, əsl alim elmi və kitabları az olsa belə elmə və sünnətə tabe olan kəsdir. Kitab və sünnətə qarşı çıxan kəs isə elmi və kitabları çox olsa belə bidət sahibidir.

---

[121] Muslim (1037, 1925, 1920, 1922, 1924); əl-Buxari (3640, 7460)

***

**[94]** Bil ki, - Allah sənə rəhm etsin! – kim Allahın dini haqqında sünnətdən və camaatdan dəlil olmadan öz rəyi, qiyası və təvili ilə danışarsa o adam Allah haqqında bilmədiyi bir şey söyləmişdir və Allah haqqında bilmədiyi bir şeyi söyləyən isə özündən uydurub danışanlardandır. Haqq Allahdan gələndir, sünnət isə peyğəmbərin – salləllahu aleyhi va səlləm – getdiyi yoldur, camaat isə Əbu Bəkr, Ömər və Osmanın xilafətləri zamanı peyğəmbərin – salləllahu aleyhi va səlləm – səhabələrinin üzərində razılaşdıqları işlərdir. Peyğəmbərin – salləllahu aleyhi va səlləm - sünnəti ilə, səhabələrinin və camaatın üzərində durduğu işlərlə kifayətlənən hər bir kəs Allahın izni ilə bidət əhlinin hamısına qalib gəlmişdir, bədəni istirahət tapmış və dini qurtulmuşdur. Çünki Allahın elçisi – salləllahu aleyhi va səlləm – deyib: "Ümmətim firqələrə parçalanacaq..." Sonra bunlardan qurtulanları bizə bəyan edərək deyib: "Bu gün mənim və səhabələrimin üzərində olduğu şey". Bax şəfa, bəyan, aşkar iş və işıqlanmış yol budur. Allahın elçisi – salləllahu aleyhi va səlləm – buyurdu: "Dərinliklərə getməkdən çəkinin! Xırdalıqlara getməkdən çəkinin! Qədim dininizə sarılın!"[122]

Bil ki, qədim din peyğəmbərin – salləllahu aleyhi va səlləm – vəfatından Osmanın öldürülməsinə qədər olan dindir. Osmanın öldürülməsi parçalanmanın əvvəli, ixtilafın əvvəli oldu. Ümmət bir-biri ilə müharibə etdi, parçalandı, tamahlara və nəfsi istəklərə tabe oldu və dünyaya meyl etdi. Allahın elçisi Muhammədin – salləllahu aleyhi va səlləm – səhabələrinin

---

[122] Bunun "dərinliklərə getməkdən çəkinin!" hissəsini İbn Bəşran "əl-Əməli" kitabında (1/49; rəq: 67) Ömər bin əl-Xattabın hədisi olaraq peyğəmbərdən – salləllahu aleyhi va səlləm - rəvayət edib. Lakin sənədi çox zəifdir. Müəllifin gətirdiyi rəvayət əslində Abdullah bin Məsudun sözüdür. Bunu əd-Dərimi "əs-Sünnə"də (1/66; rəq: 142-143), Muhamməd bin Nasr əl-Mərvazi "əs-Sünnə"də (səh: 29-30), Abdur-Razzaq "əl-Musannəf"ə (11/252; rəq: 20465) bitişik "Cami Məamər"də rəvayət edir. Onun vasitəsi ilə ət-Tabərani "əl-Mucəm əl-Kəbir"də (9/170; rəq: 8845), əl-Beyhəqi "əl-Mədxal iləs-Sunən əl-Kubra"da (səh: 271-272; rəq: 387) Əbu Qiləbə'nin hədisindən rəvayət edirlər ki, Abdullah ibn Məsud demişdir: "Elm ortadan qaldırılmadan öncə onun öyrənin! Elmin aradan qalxması isə onun əhlinin yox olmasıdır. Xırdalıq, dərinlik və bidətlərdən uzaq durun! Köhnəyə sarılın!" Eynilə bu şəkildə bunu əl-Beyhəqi "əl-Mədxal iləs-Sunən"də (səh: 372; rəq: 388), İbn Asəkir "Tərix Diməşq"də (33/52 və 43/315) Aiz Allah Əbu İdris əl-Xauləni vasitəsilə Abdullah bin Məsud'dan rəvayət edir.

etmədiyi bir şeyi sonradan heç kəsin etmək haqqı yoxdur və ya bir nəfərin öz tərəfindən və ya bidət əhlindən bir nəfər tərəfindən uydurulmuş bir işə dəvət etmək haqqı yoxdur, dəvət edən də həmin işi uyduran kimidir. Kim o şeyi iddia edərsə və ya onu dilində söyləyərsə sünnəti rədd etmiş, haqqa və camaata qarşı çıxmış, bidəti mübah görmüşdür. Belə biri bu ümmət üçün İblisdən də zərərlidir.

Kim bidət əhlinin sünnətdən nəyi tərk etdiyini və nədən ayrı düşdüyünü bilərsə və ona sarılarsa o, sünnət sahibidir və camaat sahibidir, tabe olunmağa, kömək edilməyə və qorunulmağa layiqdir. O, Allah elçisinin – salləllahu aleyhi va səlləm – vəsiyyət etdiyi kəslərdən biridir.

## (Bidətlərin səbəbi və ondan uzaq durmağın yolu)

**[95]** Bilin ki, - Allah sizə rəhm etsin! – bidətin kökləri dörd qaynaqdan qaynaqlanır və bunlardan yetmiş iki bidət qolları ortaya çıxdı, sonra hər bir bidət özlüyündə qollara bölünür və hamısı birlikdə iki mün səkkiz yüz görüşə bölünür, hamısı da zəlalətdir. Birindən başqa hamısı atəşdədir. O biri isə bu kitabda olanlara iman gətirən, orda olanlara qəlbində heç bir şübhə, heç bir şəkk olmadan etiqad edən biridir. O, sünnət sahibidir və Allahın iznilə xilas olacaq.

**[96]** Bil ki, - Allah sənə rəhm etsin! - əgər insanlar sonradan uydurulmuş işlərə gəldikdə dursaydılar, ondan ötəyə az da olsun keçməsəydilər və peyğəmbərdən – salləllahu aleyhi va səlləm – və səhabələrindən haqqında bir şeyin gəlmədiyi bir söz ortaya çıxarmasaydılar, heç bir bidət mövcud olmazdı.

**[97]** Bil ki, - Allah sənə rəhm etsin! – qul ilə onun mömin olduğu halda dönüb kafir olması arasında Allahu Təalənin nazil etdiyi bir şeyi rədd etmək və ya Allahın Kəlamına bir şey əlavə etmək və ya ondan azaltmaq və ya Allahın dediyindən bir şeyi və ya peyğəmbərin – salləllahu aleyhi va səlləm – danışdığından bir şeyi inkar etməkdən başqa bir şey durmur. Allahdan qorx – Allah sənə rəhm etsin! - və özünə bir nəzər yetir! Dində ifrata varmaqdan uzaq ol, çünki ifrata varmağın haqq yol ilə heç bir əlaqəsi yoxdur.

**[98]** Bu kitabda sənə vəsf etdiklərimin hamısı Allahdandır, Allahın elçisindəndir, salləllahu aleyhi va səlləm, onun səhabələrindən və onların tələbələrindəndir və üçüncü nəsildən dördüncü nəslə qədər yaşamış kəslərdəndir. Allahdan qorx, ey Allahın qulu! Bu kitabdakıları təsdiq et, təslim ol, (anlamadıqlarını) Allaha həvalə et və razı qal! Bu kitabı qiblə əhlindən heç kəsdən gizlətmə, ola bilsin ki, Allah bunun vasitəsilə çaş-baş

qalmış birini düşdüyü çaşqınlıqdan və ya bidət sahibini bidətindən və ya yolunu sapmış birini zəlalətindən çıxarsın və beləliklə də qurtulsun!

Allahdan qorx! İşin ilk və qədim olanına tabe ol və o, sənə bu kitabda vəsf etdiklərimdir. Allah bu kitabı oxuyan, onu yayan, onunla əməl edən, ona çağıran və onu höccət kimi istifadə edən qula rəhm etsin və onun valideynlərinə rəhm etsin! Çünki bu, Allahın dinidir və peyğəmbərinin – salləllahu aleyhi va səlləm – dinidir. Bu kitabdakından fərqli bir şeyə özünü nisbət edən kəs isə Allahın dininə əməl etmiş sayılmaz, Allahın dininin hamısını rədd etmiş sayılır.[123] Bu ona bənzəyir ki, bir qul Allahın – Təbərakə va Təalə - dediyi hər bir şeyə iman gətirir, lakin bir hərfə şəkk edirsə o, Allahu Təalənin dediyi hər bir şeyi rədd etmişdir və belə biri kafirdir. “Lə iləhə illəllah” şəhadəti sahibindən yalnız və yalnız niyyətin səmimiliyi və tam yəqinlik ilə qəbul olunduğu kimi sünnətlərdən bəziləri tərk edildikdə Allah sünnəti qəbul etməz; kim sünnətdən bir şeyi tərk edirsə sünnətin hamısını tərk etmiş olur.

Qəbul et və mübahisəni, inadkarlığı tərk et! Çünki bunların dinlə heç bir əlaqəsi yoxdur və xüsusilə də sənin zamanın şərr zamanıdır. Ona görə də Allahdan qorx!

**[99]** Əgər fitnə başlasa evinin içində qal və fitnənin yanından qaç! Tərəfkeşlikdən[124] uzaq dur! Müsəlmanlar arasında dünya uğrunda baş verən savaşların hamısı fitnədir. Tək olan və şəriki olmayan Allahdan qorx! Fitnədə çölə çıxma və fitnədə vuruşma! (Vuruşmağa) sevgi göstərmə, tərəf tutma və heç bir tərəfə meyl etmə! Onların etdiklərindən heç bir şeydən xoşun gəlməsin, çünki deyiblər ki, “kim bir qövmün əməllərini xoşlayarsa – istər (əməllər) yaxşı olsun, istərsə pis – o əməlləri edən kimidir.” Allah bizi

---

[123] Müəllif – Allah ona rəhm etsin! – bu və buna bənzər bəzi cümlələrdə mübaliğəyə yol vermişdir. Əgər o, bu sözləri ilə kitabın içindəki hər bir xırda məsələni qəsd edirsə xətadır. Lakin əgər ümumi prinsip olaraq qoyduğu qaydaları nəzərdə tutursa o zaman doğrudur və bu, kəlam elmindən uzaq durmaq, münaqişəyə girişməmək, Kitab və sünnətə sarılmaq, səhabələrin hidayətinə bağlanmaq prinsipləridir. Əks təqdirdə ortaya çıxan məna heç cür qəbul edilə bilməz, belə ki, müəllifin sözünün zahirindən anlaşılır ki, kitab xətadan təmizdir. Halbuki yalnız Allahın kitabı xətadan təmizdir. Ona görə də elm əhli haqqında yaxşı zəndə olaraq onun sözlərini ən gözəl mənaya həml etməliyik.

[124] Ərəb dili mətnindəki “asabiyyə” kəliməsi əslində qəbiləçilik, millətçilik anlamındadır. Öz qəbilənin və qohumlarının tərəfini tutmaq, onlara münasibətdə təəssübkeş olmaq anlamındadır.

və sizi Onun razı qaldığı işlərə müvəffəq etsin və bizi və sizi Ona qarşı günah işlərdən uzaq etsin!

***

**[100]** Ulduzlara az nəzər sal! Yalnız namaz vaxtları üçün onlardan istifadə etməyin istisnadır. Bundan başqa məqsədlər üçün (ulduzları baxmağı) tərk et, çünki bu, zındıqlığa götürüb çıxarır.[125]

---

[125] Astrologiya marağı müasir zamanda dəbə minmiş bir maraqdır. Bilmək lazımdır ki, bir çox alimə görə astrologiya da sehr sayılır. Alləmə əl-Mərdəvi "əl-İnsaf" kitabında (10/351) deyir: "Şeyx Təqiyyud-Din (İbn Teymiyyə) – rahiməhullah - deyir: "Yer üzündəki hadisələr üçün ulduzların hallarını dəlil olaraq istifadə etmək surətilə astrologiya sehrə aiddir." Alləmə İbn Muflih "əl-Furu" kitabında (10/207) deyir: "və "ət-Tərğib" kitabında deyilir: "Kahin və münəccim bizim əshabımıza görə sehrbaz kimidir." "ət-Tərğib" kitabı Şeyx əl-Fəxr İbn Teymiyyə'nin "Tərğib əl-Qasid fi Təqrib əl-Məqasid" adlı kitabıdır. Münəccim isə astroloqdur. Sehrin hökmünə gəldikdə isə hənbəlilər, hənəfilər və malikilər sehrin özünün küfr olduğunu deyiblər. Şafii üləması isə sehrin özünü küfr saymayıblar, lakin sehr ilə küfrün qəsd edilməsi halını küfr sayıblar. Hənbəli alimlərində bu məsələdə yekdil bir rəy yoxdur. Bu barədə İmam Əhməddən iki rəvayət gəldiyi üçün hənbəlilər də iki fərqli görüşə yönəliblər. Məzhəbin görüşünə görə küfrdür. İbn Aqil isə bunun küfr olmadığını demişdir. Astrologiyanın, münəccimliyin küfr olan sehrə daxil olub olmamasında da ixtilaf ediblər. Yuxarıdakı nəqlə əsasən Şeyxul-İslam və əl-Fəxr İbn Teymiyyə münəccimliyi də sehr sayıblar. Lakin əl-Mərdəvi "Təshih əl-Furu"da kahinlərin və münəccimlərin cəzası barədə danışarkən bu barədə iki görüş nəql edir. Birinci görüşə görə öldürülməzlər, lakin təzirə məruz tutular. İkinci görüşə görə sehrbazlar kimi öldürülməlidirlər. əl-Mərdavi birinci görüşü zikr edərkən deyir: "Bununla küfr etmiş olmur və öldürülməz, əksinə təzir olunar və bu, məzhəbin səhih görüşüdür." Bu sözlərdən anlayırıq ki, münəccimlik məzhəbin səhih görüşünə görə küfr olan sehr həddinə çatmır. Lakin bizim burada qəsd etdiyimiz münəccimlik ulduzların aləmə təsirinin olduğuna etiqad edən münəccimlik deyildir, belə ki, münəccimlik iki surətdə təzahür edə bilər. Birinci surətdə münəccim ulduzların aləmə təsirinin olduğuna, aləmi idarə etdiklərinə etiqad edir və bu, alimlərin ittifaqı ilə küfrdür. İkinci surətdə isə buna etiqad etmir, lakin ulduzların və planetlərin hərəkətinin bəzi hadisələrin olması haqqında xəbər verdiyinə etiqad edir. İxtilaf münəccimliyin bu surəti ilə bağlıdır. Şafii alimlərindən İbn Həcər əl-Məkki "əz-Zəvacir an İqtiraf əl-Kəbəir" kitabında (2/109-110) deyir: "Alimlər sehrbazın küfr edib etməməsində ixtilaf ediblər. Daha əvvəl zikr etdiyimiz sehr növlərindən ilk iki növ barəsində bir ixtilaf yoxdur, çünki ulduzların bu aləmə təsir etdiyinə etiqad edənin küfründə ixtilaf yoxdur..." İbn Həcər daha sonra (2/116) deyir: "Ulduz elmindən qadağan olan, sahiblərinin yağış yağması, qar gəlməsi, rüzgar qalxması, qiymətlərin dəyişməsi və bunun kimi gələcəkdə baş verəcək hadisələrdən xəbərdar olduqlarını iddia etməklərinə aiddir. İddia edirlər ki,

**[101]** Kəlam elminə nəzər salmaqdan və kəlam sahibləri ilə oturub durmaqdan uzaq dur! Əsərlərə və əsər əhlinə tabe ol, yalnız onlardan soruş və yalnız onlarla otur, dur və onlardan götür!

***

**[102]** Bil ki, Allahdan qorxu kimi başqa heç bir şeylə Allaha ibadət edilməmişdir; Allaha – Təbarəkə va Təalə - münasibətdə qorxu, hüzn, şəfqət və həya yolu.

**[103]** Ehtirasa, məhəbbətə dəvət edənlər, qadınlarla xəlvətdə qalanlarla və onların keçdikləri yollarda duranlarla oturub durmaqdan uzaq ol, çünki onların hamısı zəlalət üzərindədirlər.

**[104]** Bil ki, - Allah sənə rəhm etsin! – Allah – Təbarəkə va Təalə - yaratdıqlarının hamısını Ona ibadət etməyə çağırmışdır və bundan sonra dilədiyini ona qarşı bir xeyirxahlıq olaraq İslamla mükafatlandırmışdır.

***

**[105]** Əli, Muaviyə, Aişə, ət-Talha və əz-Zubeyr – Allah onların hamısına rəhmət etsin! - və onlarla birlikdə olanların müharibəsi barəsində susmaq; onlar barəsində münaqişə etmə! Onların məsələsini Allaha – Təbarəkə va Təalə - həvalə et, çünki Allahın elçisi – salləllahu aleyhi va səlləm – deyib: “Səhabələrimi, əsharımı və əxtanımı[126] (pis şeylərlə) zikr etməyin!”[127] Yenə

---

onlar bunu planetlərin seyri, onların birləşib ayrılmaqları və müəyyən zamanlarda görünməkləri ilə dərk edirlər. Bu isə Allahın sahib olduğu elmdir və Ondan başqası bunu bilməz. Kim bunu bildiyini iddia edərsə o, fasiqdir, hətta bəzi hallarda bu, onu küfrə götürə bilər.”

[126] Əshar və əxtan kişinin zövcəsi tərəfindən qohumlarıdır.

[127] ət-Təbərani bunu “əl-Mucəm əl-Kəbir” kitabında (6/104; rəq: 5640) “Ey insanlar! Məni əshabımda, əsharımda və əxtanımda hifz edin...” sözləri ilə rəvayət edib. Buna yaxın ləfzlərlə rəvayət olunub və bunların heç biri səhih deyildir.

demişdir: “Həqiqətən Allah – Təbərakə va Təalə - Bədr əhlinə baxdı və dedi: “Dilədiyinizi edin, çünki Mən sizi bağışlamışam.”[128]

[128] Bunu əl-Buxari (3007) və Muslim (2494) Əlinin hədisindən rəvayət ediblər.

## (Fəsl)

**[106]** Bil ki, - Allah sənə rəhm etsin! – bir müsəlmanın malı yalnız onun öz könül xoşluğu ilə verməsi halında halal ola bilər. Hətta əgər bir kimsədə haram bir mal varsa o mal onun öz boynundadır, həmin maldan onun izni olmadan bir şey götürmək heç kəsə caiz deyildir, çünki ola bilsin ki, bu adam tövbə etsin və malı öz sahiblərinə geri versin, yoxsa sən haram bir mal götürmüş olacaqdın.

**[107]** Qazanclar mütləqdir; sənə onlardan səhih olduğu görünənlər mütləqdir, yalnız fasid olduğu aşkar olan istisnadır.[129] Əgər fasiddirsə, o maldan zəruri ehtiyacını qarşılayacaq qədərini götürə bilər. "Qazancı tərk edim, (insanların) verdiyini götürüm" deməməlidir. Nə səhabələr, nə də bizim bu zamanımıza qədər yaşamış alimlər belə etməyiblər. Ömər – radiyallahu anhu – deyib: "Tərkibində bir qədər alçaqlıq olan qazanc insanlardan dilənməkdən yaxşıdır.[130]"[131]

***

[129] Bu, ümumi fiqhi bir qaydadır. Qazanc, maaş, mükafat və ticarət kimi işlərdə haram və ya haramla qarışmış mal aşkara çıxmayana qədər əsli hökm halal olaraq qalır. Əgər malın haram olduğu aşkar olarsa onu götürmək haram olar, malın qarışıq olduğu aşkar olarsa qarışıqlığın miqdarında məkruh olar.

[130] Ola bilər ki, insanlar hər hansı bir işə dəyərsiz və alçaq bir iş kimi baxsınlar. Misal üçün zibil daşıyan və buna bənzər işlər insanların gözündə həqir və dəyərsiz işlərdir. Lakin dilənmək əvəzinə o cür işə qatlanmaq qat-qat xeyirlidir.

[131] Bunu İbn Əbid-Dunyə "İsləhul-Məl" (səh: 298; rəq: 321), İbn Hibbən "əs-Siqat"da (8/204), İbn Abdil-Bərr "ət-Təmhid"də (18/329) Ömər bin əl-Xattab'dan rəvayət ediblər. Bu rəvayətlərin bəzilərində alçaqlıq, həqirlik mənasını verən "əd-dəniyyə" sözü yerinə şübhə mənasını verən "ər-riybə" sözü gəlmişdir.

**[108]** Beş vaxt namazı kimin arxasında qılsan caizdir, həmin insanın bir cəhmi olması isə istisnadır, çünki o, tətil əhlidir. Əgər belə birinin arxasında namaz qılsan namazını yenidən qıl! Əgər cümə günü imamın bir cəhmi olarsa və o, sultandırsa, arxasında namaz qıl və (sonra) namazını yenidən qıl! Əgər sənə imamlıq edən sultan və ya bir başqası sünnət sahibirsə arxasında namaz qıl və namazını təkrarlama!

***

**[109]** Əbu Bəkr və Ömərin Aişənin otağında peyğəmbər – salləllahu aleyhi va səlləm – ilə olduğuna iman etmək; onunla birlikdə orada dəfn olunublar. (Peyğəmbərin) qəbrinin yanına gəlsən peyğəmbərdən – salləllahu aleyhi va səlləm – sonra onların ikisinə də salam verməк vacibdir.[132]

[132] Bu, müəllifin ictihadıdır. Alimlər arasında məşhur olan görüş budur ki, peyğəmbərin – salləllahu aleyhi va səlləm – qəbrini ziyarət etmək və salam vermək müstəhəbdir.

## (Yaxşılıqları əmr edib pisliklərdən çəkindirmək)

**[110]** Qılıncından və ya əsasından qorxmaq halı müstəsna olmaqla (digər bütün hallarda) yaxşılıqları əmr edib, pisliklərdən çəkindirmək vacibdir.[133]

**[111]** Salam Allahın bütün qullarına verilməlidir.

***

**[112]** Kim heç bir üzr olmadan məsciddə cümə və camaat namazlarını tərk edərsə o, bidətçidir. Üzr isə misal üçün məscidə getməyə taqəti olmayacaq şəkildə xəstəlik və ya zalım sultandan qorxudur. Bundan başqa hallarda isə onun üzrü yoxdur.

**[113]** Kim bir imamın arxasında namaz qılar, lakin ona tabe olmazsa, onun namazı yoxdur.

***

**[114]** Yaxşılığı əmr edib pisliklərdən çəkindirmək isə qılınc ilə deyil, əl, dil və qəlb vasitəsilə olur.[134]

---

[133] Alimlər yaxşılığı əmr edib pislikdən çəkindirməyin hökmü barəsində ixtilaf ediblər. Bu, hər bir müsəlmana vacibdir, yoxsa ümumən müsəlman topluma vacibdir? Alimlərin böyük əksəriyyətinə görə bunun hökmü fərzu-kifayədir, yəni hər bir fərdə vacib deyildir. Əgər bir qrup bu işin öhdəsindən gəlirsə digər müsəlmanlara vacib olmur, lakin müstəhəb olur. Bir qrup alimə görə bu vəzifə hər bir müsəlmana vacibdir. Məşhur təfsir alimi İbn Kəsir bu görüşdə olan alimlərdəndir.

**[115]** Müsəlmanlardan halı örtülü olan kəs aşkarda bir şübhəsi görünməyən kəsdir.[135]

***

**[116]** Qulların batini elmlərdən iddia etdiyi, Kitab və sünnətdə olmayan hər bir elm bidət və zəlalətdir. Heç kəsə o elmlə əməl etmək və ona çağırmaq caiz deyildir.

***

**[117]** Hər hansı qadın özünü bir kişiyə hədiyyə edərsə həmin kişiyə halal olmaz, əgər kişi o qadından istifadə edərsə hər ikisi də cəzalandırılmalıdır. (Qadın) yalnız bir vəli, iki adil şahid və mehr ilə (halal olur).

---

[134] Bu barədə kitabın əvvəlindəki dipnotların birində söz açmışdıq. İmam Əhmədin məzhəbi budur. İstənilən kəsin etdiyi münkəri əl, söz və qəlb ilə inkar etmək vacibdir və hər hansı bir kəs bundan müstəsna deyildir. Hakimlərin münkərlərini imkan olduqda əl ilə düzəltmək, olmazsa dil ilə düzəltmək vacibdir. Rabbani alimlərin həyatlarına nəzər salan kəs bu həqiqəti aşkar şəkildə görəcəkdir. Şeyxul-İslam İbn Teymiyyənin əmirin qərarına qarşı çıxaraq əl-Hafiz əl-Mizzi'ni həbsxanadan azad etməsi, əl-Hafiz Abdul-Ğani əl-Məqdisinin əyləncə alətlərini sındırmasını və daha bir çox misalı göstərmək olar. Lakin qılınc ilə münkəri inkar etmək İmam Əhmədə görə caiz deyildir.

[135] əl-Beyhəqi "əs-Sunən"də (10/124), Əbu Nueym "əl-Hilyə"də (9/224), Əbu Mushir "ən-Nüsxə"də (səh: 61; rəq: 72) bir çox yolla İbrahim ən-Nəxai'dən belə dediyini rəvayət ediblər: "Belə deyərdilər: "Müsəlmanlar arasında adil olan kəs aşkarda bir şübhəsi görünməyən kəsdir."

## (Səhabələrə və əsərlərə tənə edən bidətçidir)

**[118]** Bir kimsəni peyğəmbərin – salləllahu aleyhi va sələm – səhabələrindən hər hansı birinə tənə edərkən görsən bil ki, o, şərr görüş və bidət sahibidir, çünki Allahın elçisi – salləllahu aleyhi va sələm – deyir: "Səhabələrimin adı çəkildikdə susun!"[136] Peyğəmbər – salləllahu aleyhi va sələm – ölümündən sonra onların nə xətalar edəcəklərini bilirdi, buna baxmayaraq onlar haqqında xeyirdən başqa bir şey söyləməmişdir. Həmçinin buyurur: "Səhabələrimi buraxın və onlar haqqında xeyirdən başqa bir söz söyləməyin!"[137] Onların xətalarından, onların savaşlarından və haqqında elminin olmadığı şeylərdən heç bir şey haqqında danışma! Bu barədə danışan birinə də qulaq asma, çünki dinləsən o, sənin qəlbini salamat buraxmaz.

**[119]** Bir kimsənin əsərlərə tənə etdiyini, əsərləri inkar etdiyini və ya əsərlərdən başqasını istədiyini eşitsən onun İslamında şəkk et və onun bidət sahibi olan bir bidətçi olduğunda şəkk etmə!

---

[136] ət-Təbərani "əl-Mucəm əl-Kəbir"də (2/96; rəq: 1427) Səubən'in hədisindən və (10/198; rəq: 10448) Abdullah bin Məsudun hədisindən rəvayət etmişdir. Bunu Şeyx əl-Albani "əs-Silsilə əs-Sahihə"də (34) səhih saymışdır.

[137] Görünür ki, müəllif bunu iki ayrı hədisdən götürmüşdür. "Səhabələrimi buraxın!" sözü ilə olan hədisi əl-Bəzzər (3/290; Kəşful-Əstər) həsən sənəd ilə rəvayət edir. "Onlar haqqında yalnız xeyir söyləyin!" hədisini isə Xeysəmə bin Süleyman "Fədailus-Sahabə"də rəvayət edir. Bunu İbn Hacər "Cuzun fihi Turuq Hədis Lə Təsubbu Əshəbi" adlı kiçik kitabında (səh: 70-71) zikr etmişdir. Sənədində zəiflik vardır.

## (Zalım sultanlar)

**[120]** Bil ki, sultanın zalımlığı Allahın – Azzə va Cəllə - peyğəmbərinin – salləllahu aleyhi va səlləm – dili ilə vacib qıldığı fərzlərindən hər hansı bir fərzi naqis etmir. Onun zalımlığı öz əleyhinədir və onunla birlikdə etdiyin ibadətlər və xeyir əməllər sənin üçün inşallah səhihdir. Yəni camaat və cümə namazı onlarladır, cihad onlarladır və bütün itaətlərdə ona şərik ol və sən öz niyyətinə görə qazanırsan.

**[121]** Əgər bir kimsəni sultana bəd-dua edərkən görsən bil ki, o, bidət sahibidir və əgər kiminsə sultanın islah olması üçün dua etdiyini görsən bil ki, o, inşallah sünnət sahibidir. Çünki Fudeyl[138] deyir: “Əgər mənim bir duam olsaydı onu yalnız sultan üçün edərdim.” Əhməd bin Kəmil bizə xəbər verdi və dedi: əl-Hüseyn bin Muhamməd ət-Təbəri bizə rəvayət etdi: Mərdəveyh əs-Saiğ bizə rəvayət etdi və dedi: Fudeyli belə deyərkən eşitdim: “Mənim bir müstəcəb[139] duam olsaydı onu yalnız sultan üçün edərdim.” Ona dedilər: “Ey Əbu Əli! Bunu bizə izah et!” Dedi: “Əgər onu özüm üçün etsəm məndən ötə keçməyəcək, əgər sultan üçün etsəm düzələr və onun düzəlməsi ilə Allahın bəndələri və ölkə düzələr.”[140]

Onlara islah olunmaları üçün dua etməklə əmr olunmuşuq. Hətta zülm etsələr, haqsızlıq etsələr belə onlara bəd-dua etməklə əmr olunmamışıq, çünki onların zülmləri və haqsızlıqları özlərinin əleyhinədir, lakin islah olunmaqları isə həm özlərinə, həm də müsəlmanlara xeyirdir.

---

[138] Fudeyl bin İyad bin Məsud Əbu Əli ət-Təmimi əl-Yərbui əl-Mərvazi böyük zahid və alim biri olub. əz-Zəhəbi onu vəsf edərkən deyir: “İmam, nümunəvi insan, mötəbər, şeyxul-islam.” Hicri 187-ci ildə vəfat edib.
[139] Müstəcəb dua Allahın qəbul etdiyi duadır.
[140] Bunu Əbu Nueym “əl-Hilyə”də (8/91), İbn Asəkir “Tarix Diməşq”də (48/447) rəvayət edir.

***

**[122]** Möminlərin analarından heç birini xeyirdən başqa bir şeylə yad etmə!

***

**[123]** Bir kimsəni sultanla və başqaları ilə birlikdə fərzləri camaat içində qılmağa əhəmiyyət verdiyini görsən bil ki, həmin adam inşallah sünnət sahibidir. Əgər camaat içində fərz namazlarını – sultanla birlikdə olsa belə – qılmağa önəm verməyən bir kəsi görsən onun bidət sahib olduğunu bil!

***

**[124]** Halal bir şey halal olduğuna dair şahidlik etdiyin və and içdiyin şeydir. Haram da bunun kimidir. Qəlbində rahatsızlığa səbəb olan bir şey isə şübhədir.

**[125]** Məstur olanlar sitri aşkar olanlardır, məhtuk olanlar isə günahları aşkar olandır.[141]

[141] Məstur halı örtülü və qapalı olan kəsdir. Sitr isə örtü, pərdə anlamını verir. Yəni insanlar içində fasiq olaraq tanınmayan kəsdir. Məhtuk isə insanlar içində açıq şəkildə günah işləyəndir.

## (Bidətçilərin əlaməti)

**[126]** Əgər bir kimsəni “fılankəs müşəbbihədir” və “fılankəs təşbih barədə danışır” dediyini eşitsən onu ittiham et və bil ki, o, cəhmidir. Bir nəfərin “fılankəs nasibidir” dediyini eşitsən bil ki, o, rafizidir. Bir kimsənin “tövhidlə danış, mənə tövhidi izah et” dediyini eşitsən bil ki, o, xaricidir, mötəzilidir. Yaxud da “fılankəs mucbirdir” deyirsə və ya icbar barəsində və ya adl haqqında danışırsa, bil ki, o, qədəridir, çünki bütün bu adlar sonradan uydurulmuş adlardır və onları bidət əhli uydurub.[142]

Abdullah bin əl-Mubarək[143] deyir: “Kufə əhlindən rafiziliklə bağlı heç bir şey götürmə! Şam əhlindən isə qılıncla bağlı heç bir şey götürmə! Bəsrə əhlindən də qədər haqqında heç bir şey götürmə! Xorasan əhlindən isə irca ilə bir şey qəbul etmə! Məkkə əhlindən isə sarf haqqında bir şey götürmə!

---

[142] Əhlus-Sunnə hər zaman firqələr arasında orta mövqe tutub. Ona görə də xaricilər və mötəzilə əhlis-sunnəti mürciəlikdə, mürciələr xavariclikdə ittiham ediblər. Nasibilər rafizilikdə, rafizilər isə nasibilikdə, qədərilər cəbriyyəlikdə, cərbiyyə isə qədərilikdə ittiham edib. Orta mövqe tutanların hər zaman halı belə olmuşdur. Cəhmilər Allahın isim və sifətlərini mənalarından ayırdıqları üçün, onları bir növ inkar etdikləri üçün və onların məxluqlara aid sifətlər olduğunu iddia etdikləri üçün, bu sifətləri təsdiq edənləri təşbih əhli adlandırardılar. Təşbih isə Yaradanı yaradılmışlara bənzətməkdir. Səhabələr arasında münaqişə və qarşıdurmalar olduğu halda əhlus-sunnə onların hamısını sevib və aralarında baş vermiş konfliktləri isə Allaha həvalə edib. Lakin Əlinin – kərraməllahu vachəhu – tərəfini tutan rafizilər digər səhabələri də sevən sünniləri nasibilikdə ittiham ediblər. Mötəzilə və xaricilər özlərinə xas bir tövhid anlayışına sahib idilər və onlar bu məsələni həmişə qabardardılar. Ona görə də bu məsələni qabardanlar müəllifə görə xaricilər və mötəzililər olur. İnsanın öz əməllərini etməyə məcbur olduğunu deyənlər cəbriyyə firqəsidir. Qədərilər isə onların əksinə insanın öz əməllərini özünün yaratdığını iddia edirlər. Əhlus-Sunnət bu iki firqənin arasında olduğu üçün qədərilər sünniləri də cəbriyyəlikdə ittiham edirlər.

[143] Abdullah bin əl-Mubarək bin Vadih əl-Hanzali ət-Təmimi Əbu Abdir-Rahmən əl-Mərvazi nəhəng imamlardan və İslam hafizlərindən biridir. Zühd və təqva əhlindəndir. Hicri 118-ci ildə doğulmuş və hicri 181-ci ildə vəfat etmişdir.

Mədinə əhlindən isə nəğmə haqqında bir şey qəbul etmə! Bu işlərdə onlardan heç bir şey götürmə![144]”[145]

***

**[127]** Bir nəfərin Əbu Hureyranı, Ənəs bin Maliki, Useyd bin Hudeyri sevdiyini görsən bil ki, həmin adam inşallah sünnət sahibidir.

**[128]** Hər hansı bir kəsin Əyyub[146], İbn Aun[147], Yunus bin Ubeyd[148], Abdullah bin İdris əl-Əudi[149], əş-Şabi[150], Malik bin Miğval[151], Yezid bin Zurey[152], Muaz bin Muaz[153], Vahb bin Cərir[154], Həmməd bin Sələmə[155],

---

[144] Rafizilik fitnəsi Kufədə, qədər fitnəsi Bəsra şəhərində, irca fitnəsi isə Xorasanda geniş yayılmışdı. Məkkəyə isə dünyanın hər tərəfindən tacirlər gəldiyi üçün Məkkə əhli valyuta mübadiləsi işində gevşəklik göstərirdi. Mədinə əhlindən isə nəql olunduğuna görə onlar nəğməyə izn verirmişlər.

[145] İbnul-Qayyim “İğasətul-Ləhəfən” kitabında (1/229) İmam Əhməd bin Hənbəlin belə dediyini nəql edir: “Yəhya əl-Qattanı belə deyərkən eşitdim: “Əgər insan bütün rüxsətlərlə əməl edərsə, Kufə əhlinin nəbiz haqqındakı görüşü ilə, Mədinə əhlinin mudiqi haqqındakı görüşü ilə, Məkkə əhlinin siğə haqqındakı görüşü ilə əməl edərsə fasiq olar.” Rüxsətlərlə əməl etməklə qəsd olunan ayrı-ayrı alimlərin bəzi haram əməllərə verdikləri rüxsətlərlə əməl etməkdir.

[146] Əyyub bin Əbi Təmimə əs-Sixtiyəni mötəbər və təqva əhli bir alimdir. Şubə deyir: “O, fəqihlərin ağasıdır.” İbn Uyeynə deyir: “Onun kimi birisini görmədim.” Hicri 131-ci ildə vəfat edib.

[147] Abdullah bin Aun Bəsra əhlinin şeyxi və alimidir. Təqva əhlindən böyük bir zatdır. İbn Mehdi deyir: “İraqda İbn Aundan yaxşı sünnəti bilən yoxdur.” Hicri 150-ci ildə vəfat edib.

[148] Yunus bin Ubeyd Əbu Abdilləh böyük bir imam və hafiz idi. Abdul-Qeys qəbiləsinin azadlı qulu olmuşdur. Hicri 139-cu ildə vəfat edib.

[149] Abdullah bin İdris əl-Əudi Əbu Muhamməd əl-Kufi böyük hafiz və abid bir zatdır. Əbu Hatim deyir: “O, müsəlmanların imamlarından bir imamdır, höccətdir.” Hicri 192-ci ildə vəfat edib.

[150] Amir bin Şərahil əş-Şabi əl-Kufi mötəbər, hafiz və mufti biri idi. Bir qrup səhabə ilə qarşılaşmışdı. Hicri 104-cü ildə vəfat edib.

[151] Malik bin Miğval əl-Bəcəli əl-Kufi çox hədis rəvayət edən, etibarlı və höccət sayılan bir alimdir. Hicri 159-cu ildə vəfat edib.

[152] Yezid bin Zurey Əbu Muaviyə - rahiməhullah – İmam Əhmədin hədisdə şeyxidir. Etibarlı, abid və alim biri idi. Hicri 182-ci ildə vəfat edib.

[153] Muaz bin Muaz Əbul-Musənnə əl-Anbəri əl-Basri hədis rəvayətində hifzdin və sidqində ən yuxarı məqama sahib zatlardan biri idi. Əhməd bin Hənbəl və başqaları onu tərifləmişlər. Hicri 196-ci ildə vəfat edib.

Həmməd bin Zeyd[156], Malik bin Ənəs, əl-Əvzai[157] və Zaidə bin Qudaməni[158] sevdiyini görsən bil ki, o, sünnət sahibidir. Əgər bir kimsənin əl-Həccəc bin əl-Minhəli[159], Əhməd bin Hənbəli, Əhməd bin Nəsri[160] sevdiyini görsən bil ki, o, - əgər onları xeyirlə yad edirsə və onların dediklərini deyirsə - inşallah sünnət sahibidir.

**[129]** Əgər bir nəfəri bidət əhlindən bir nəfərlə oturub durarkən görsən onu xəbərdar et və ona (həmin adamı) tanıt! Bunu bildikdən sonra onunla oturub durmağa davam edərsə ondan çəkin, çünki o, bidət sahibidir.

**[130]** Bir adama əsərlər versən və onları istəmədiyini, Quranı istədiyini görsən heç şəkk etmə ki, o adam özündə zındıqlıq daşıyan biridir.[161] Onun yanından dur və onu tərk et!

**[131]** Bil ki, bidətlərin hamısı pisdir və qılınca çağırır. Onların içində ən pis və ən küfr olanı rafizilər, mötəzilə və cəhmiyyədir, çünki onlar insanların tə'tilə və zındıqlığa düşməsini istəyirlər.

**[132]** Bil ki, bir kimsə Muhammədin – salləllahu aleyhi va səlləm – səhabələrindən hər hansı biri haqqında pis danışarsa, bil ki, o, yalnız Muhamməd haqqında – salləllahu aleyhi va səlləm – (pis danışmaq) istəmişdir və ona qəbrində əziyyət etmişdir.

---

[154] Vahb bin Cərir bin Həzim Əbul-Abbas əl-Cəhdami mötəbər bir alim olmuşdur. Hicri 206-ci ildə vəfat edib.

[155] Həmməd bin Sələmə bin Dinər Əbu Sələmə əl-Basri böyük bir hafizdir. Basra əhlinin şeyxidir, öz zamanının insanlarının ağası olmuşdur. Hicri 166-cı ildə vəfat edib.

[156] Həmməd bin Zeyd bin Dirhəm Əbu İsmayıl Basra əhlinin imamı idi. Təqva və din əhlindən olmuşdur. Hicri 179-cu ildə vəfat edib.

[157] Böyük imam, öz zamanının alləməsi Abdur-Rahmən bin Amr Əbu Amr əl-Əvzai Şam əhlinin fəqihi və imamı idi. Hicri 157-ci ildə vəfat edib.

[158] Zaidə bin Qudamə Əbus-Salt əs-Səqafi əl-Kufi böyük bir hafiz idi. Əbu Hatim deyir: "Mötəbərdir, sünnət sahibidir." Hicri 161-ci ildə vəfat edib.

[159] əl-Həccəc bin Minhəl əl-Basri Əbu Muhamməd əl-Ənməti mötəbər və sünnət sahibi bir alimdir. əl-Buxari ondan hədis rəvayət edib. Hicri 217-ci ildə vəfat edib.

[160] Əhməd bin Nasr bin Malik əl-Xuzai öz zamanının ən böyük alimlərindən idi. Quranın məxluq olub olmaması haqqındakı fitnə zamanı özü yaxşılığı əmr edərdi və pisliklərdən çəkindirərdi. Xəlifənin münkərlərini açıq şəkildə inkar edərdi. Hicri 231-cı ildə xəlifə tərəfindən öldürüldü.

[161] Çünki sünnəti tərk edib yalnız Quranla əməl etdiyini iddia edən kəslər əslində şəriətin böyük bir hissəsini puç etmiş kəslərdir. Onların Quranı öz ağlı ilə anlayıb zəlalətə düşməkləri çox asan bir işdir.

**[133]** Əgər bir insandan bidət olan bir şey sənə görünərsə, ondan ehtiyatlı ol, çünki sənə gizli qalanlar şübhəsiz ki, sənə zahirdə görünənlərdən çoxdur.

**[134]** Əgər əhli-sünnətdən bir kimsənin tutduğu yol və məzhəbinin pis olduğunu, fasiq və facir, günah sahibi, yolunu azmış olduğunu görsən və o, (bu halı ilə belə) sünnət üzərindədirsə, onunla yoldaşlıq et, onunla otur dur! Çünki onun günahları sənə zərər verməz. Lakin əgər müctəhid – hətta zahid və özünü ibadətə həsr etmiş biri olduğu görünsə belə -, amma bidət sahibi birini görsən onunla oturub durma, onun yanında olma, sözünü dinləmə, onunla bir yol getmə! Çünki mən onun öz təriqətini bəzəməyəcəyindən və nəticədə onunla birlikdə həlak olmayacağından əmin deyiləm.

Yunus bin Ubeyd öz oğlunu bidət sahibi birinin yanından çıxarkən gördü və dedi: “Ey oğul! Haradan gəlirsən?” Dedi: “Fılankəsin yanından.” Dedi: “Ey oğul! Sənin bir xunsənin[162] evindən çıxdığını görməyim mənim üçün fılankəsin[163] evindən çıxdığını görməyimdən daha sevimlidir. Allahın hüzuruna, ey oğul, zinakar, oğru, fasiq, xain kimi çıxmağın mənim üçün Onun hüzuruna fılankəs və fılankəslərin etiqadı üzərində çıxmağından daha sevimlidir.[164]

Məgər görmürsən ki, Yunus bin Ubeyd xunsənin oğlunu dinindən azdırmayacağını, bidət sahibinin isə onu kafir edənə qədər onu (dinindən) azdıracağını bilirdi?!

**[135]** Öz zamanının insanlarından xüsusilə çox ehtiyatlı ol! Kiminlə oturduğuna, kimə dinlədiyinə, kiminlə yoldaşlıq etdiyinə fikir ver, çünki insanlar onlardan Allahın qoruduğu kimsələr müstəsna olmaqla sanki riddət içindədirlər.

---

[162] Xunsə həm erkək, həm də dişi cinsi üzvü olan kəslərdir. Əxlaqsız bir qadının evini ziyarət etmək bir müsibətdirsə, xunsənin evini ziyarət etmək isə iki müsibətdir, çünki bu, insanlar yanında daha çirkin qarşılanır.

[163] Bəzi əlyazmalarda onun adı Amr bin Ubeyd olaraq zikr olunub və o, mötəzililərin imamlarından biridir.

[164] Bunun bənzərini əl-Laləkai “Şərh Usul İtiqad Əhl əs-Sunnə val-Cəməa”da (2/817-818; rəq: 1378), əl-Xatib “Tarix Bəğdəd”də (12/172), əl-Bəğavi “əl-Cadiyyət”də (1/203; rəq: 1330), Əbu Nueym “əl-Hilyə”də (3/21) rəvayət ediblər.

**[136]** Bax və bir adamın İbn Əbi Duad'ı[165], Bişr əl-Mərisi'ni[166], Suməmə'ni[167] və ya Əbul-Huzeyl'i[168] və ya Hişəm əl-Futi'ni və ya onlara tabe olanlardan birini və ya tərəfdarlarından birini (gözəl sözlərlə) yad etdiyini eşitsən ondan ehtiyatlı ol, çünki o, bidət sahibidir, çünki bu kəslər riddət üzərində olublar və onları xeyir ilə yad edən adamı tərk et! Onlardan birini yad edən onlarla eyni səviyyədədir.

***

**[137]** İslamda (insanın etiqadını) sınağa çəkmək bidətdir, bizim bu günümüzə gəldikdə isə sünnətə görə imtihan edilirlər[169], çünki o deyib: "Şübhəsiz ki, bu elm dindir, ona görə də dininizi kimdən götürdüyünüzə fikir verin!" "Yalnız şəhadətini qəbul etdiyiniz kimsələrdən hədis qəbul edin!"

Beləliklə baxmalısan, əgər sünnət sahibidirsə, elmi varsa və saduqdursa, ondan (hədis) yaza bilərsən, əks təqdirdə onu tərk etməlisən!

***

---

165 O, Əhməd bin əl-Fərəc bin Əbi Duad əl-İyədi əl-Mötəzilidir. Zəlalət imamlarından biridir. Zamanında sultanı insanları "Quran məxluqdur" deməklə imtihana çəkməyə sövq etmişdi. Hicri 240-ci ildə həlak olub.

166 Bişr bin Ğiyəs bin Əbi Kərimə əl-Mərisi mötəzilə şeyxlərindən biri olub. Quranın məxluq olduğunu deyən və buna dəvət edənlərdən biri idi. Hicri 218-ci ildə vəfat edib.

167 Suməmə bin Əşras ən-Nəmimi mötəzililərin rəhbərlərindən biri olub. Hicri 213-cü ildə vəfat edib.

168 Muhamməd bin əl-Huzeyl bin Abdilləh Əbul-Huzeyl əl-Alləf əl-Basri mötəzililərin şeyxi və bidət və zəlalət imamlarından biri olub. Hicri 235-ci ildə vəfat edib.

169 Anladığımız kimi müsəlmanları imtihan etmək kimin hədisinin qəbul edilib edilməyəcəyini öyrənmək üçündür. Bizim zamanımızda belə bir ehtiyac olmadığı üçün insanların etiqadını öyrənmək üçün imtihana çəkmək olmaz, çünki bu, müəllifin də dediyi kimi bidətdir.

**[138]** Əgər haqq üzərində və səndən əvvəlki sünnət əhlinin yolu üzərində müstəqim olmaq istəsən kəlam elmindən, kəlam əhlindən, münaqişə, mübahisə, qiyas və dində münazərə etməkdən uzaq dur! Onlardan bir şey götürməsən belə onların sözünə qulaq asmağın qəlbdə şəkk doğurur, bu da qəbul etmək üçün kifayət edir ki, nəticədə həlak olursan. Kəlam elmi, münaqişə, mübahisə və qiyas ortaya çıxmasaydı zındıqlıq, bidət, zəlalət əsla mövcud olmazdı, çünki bunlar bidətin, şəklərin və zındıqlığın qapılarıdır.

**[139]** Öz nəfsinin qayğına qal! Əsərə və əsər əhlinə tabe olman və təqlid etmən vacibdir, çünki bu din yalnız təqliddir, [yəni peyğəmbərə, salləllahu aleyhi va səlləm və əshabına, ridvanullah aleyhim əcməin!] Bizdən əvvəlkilər bizi çaşqınlıqda/qarmaqarışıqlıqda buraxmayıblar və onları təqlid et və rahatlıq tap! Əsər və əsər əhlindən ötəyə həddi aşma! Mütəşabihlərdə dur və (onlara) heç bir şeyi qiyas etmə! Özündən bir hiylə çıxardıb onunla bidət əhlini rədd etməyə çalışma, çünki sənə onlarla münasibətdə sakit durmaq əmr olunub və sənin nəfsinə (təsir etmələrinə) imkan vermə!

Bilmirsənmi ki, Muhammməd bin Sirin[170] fəziləti ilə birlikdə bir məsələdə belə bidət əhlindən bir nəfərə cavab verməmiş, nə də ondan Allahın Kitabındakı bir ayəni belə dinləməmişdir. Buna görə də ondan soruşanda demişdir: “Qorxuram ki, ayəni təhrif edər və qəlbimə bir şəkk düşər.”[171]

**[140]** Əgər bir adamın peyğəmbərdən – salləllahu aleyhi va səlləm – gələn əsərləri eşidərkən “biz Allahı təzim edirik!” dediyini eşitsən bil ki, o, cəhmidir. Allahın elçisinin – salləllahu aleyhi va səlləm - əsərlərini rədd etmək istəyir və bu sözü ilə Allahın elçisinin – salləllahu aleyhi va səlləm - əsərlərini dəf edir. O, (Allahı axirətdə) görmək, (Allahın dünya səmasına) enməsi və buna bənzər hədisləri eşidərkən Allahı təzim etdiyini, Onu tənzih etdiyini iddia edir. Məgər o, Allahın elçisinin – salləllahu aleyhi va səlləm - əsərlərini rədd etmirmi?! Əgər “biz Allahın bir yerdən başqa yerə köçməyəcək qədər Əzəmətli olduğuna etiqad edirik” deyərsə artıq o,

---

[170] Muhammməd bin Sirin bin Əbi Amr Əbu Bəkr əl-Ənsari məşhur tabii alim və imamdır. Malik bin Ənəsin azadlı quludur. Tabe olunan imam, fəqih və təqva əhlidir. Hicri 110-cu ildə vəfat edib.

[171] Bunu əd-Dərimi ”əs-Sünən”də (1/120; rəq: 394), əl-Laləkai “Usul İtiqad Əhlis-Sunnə”də (1/150-151; rəq: 242), İbn Vaddah əl-Qurtubi “əl-Bidə van-Nəhyu anhə”də (səh:53), İbn Batta “əl-İbənə əl-Kubra”da (377) rəvayət ediblər.

Allahı başqalarından daha yaxşı tanıdığını iddia etmişdir. Onlardan uzaq ol, çünki adi camaatın çoxu və digərləri onların halındadır və insanları onlar haqqında xəbərdar et!

***

**[141]** Əgər bir kimsə səndən bu kitabdakı bir məsələ haqqında soruşsa, əgər o, (bununla) haqqı öyrənməyi qəsd edirsə onunla danış və ona doğru yolu göstər! Lakin əgər gəlib səninlə münazərə etmək istəsə ondan uzaq ol, çünki münazərədə münaqəşə, mücadələ, qalib gəlmək istəyi, düşmənçilik, qəzəb vardır və sənə bunlar qəti olaraq qadağan edilib. Hər ikiniz də birlikdə haqq yolundan çıxmış olursuz. Fəqihlərimizdən, alimlərimizdən heç kimsədən onun münazərə və ya mücadələ və ya düşməncə rəqabət aparması barədə bir xəbər bizə gəlib çatmayıb.

**[142]** əl-Həsən əl-Bəsri[172] dedi: "Hikmətli adam hikmətini yaymaq üçün nə mübahisə edər, nə də yaltaqlanar. Əgər (hikməti) qəbul olunarsa Allaha həmd edər, rədd edilərsə (yenə) Allaha həmd edər."[173]

Bir nəfər əl-Həsən'in yanına gəldi və dedi: "Din barədə səninlə münazirə edək?" əl-Həsən (ona) dedi: "Mən öz dinimi bilirəm, əgər sən öz dinini itirmisənsə get özün axtar!"[174]

Allahın elçisi – salləllahu aleyhi va səlləm – evinin qapısı qarşısında bir qrup insanın (danışığını) eşitdi ki, onlardan biri belə deyirdi: "Məgər Allah belə demir?" Bir başqası dedi: "Məgər Allah belə demir?" (Evindən) qəzəbli halda çıxdı və dedi: "Sizə bu əmr edilibmi?! Bəlkə sizə buna görə (peyğəmbər olaraq) göndərilmişəm ki, siz Allahın Kitabının bir hissəsini

---

172 Əbu Said əl-Həsən bin Əbil-Həsən əl-Basri böyük tabii imamlardan biridir. Hicri 110-cu ildə vəfat edib.
173 Bunu Nueym bin Həmməd "əz-Zəvaid aləz-Zuhd li İbn əl-Mubarək"də (səh: 8; rəq: 30) rəvayət edib.
174 Bunu əl-Laləkai "İtiqad Əhlis-Sunnə"də (1/144; rəq: 215), əl-Acurri "əş-Şəria"da (səh: 57) və İbn Batta "əl-İbənə əl-Kubra"da (586) rəvayət edib.

digər hissəsilə toqquşdurasınız?!”[175] Beləliklə münaqəşə etmələrini qadağan etdi.

İbn Ömər münazərəni sevməzdi və Malik bin Ənəs, ondan əvvəl və ondan sonra günümüzə qədər (yaşamış) kəslər (münazərəni sevməzdi). Allahın sözü yaratdıqlarının sözündən daha böyükdür. Allah – Təbərakə va Təalə - deyir:

“**Allahın ayələri barəsində yalnız kafirlər mübahisə edərlər.**”[176]

Bir adam Ömərdən soruşdu: “ən-Nəşitati Nəşta” nə deməkdir?” (Ömər) dedi: “Əgər başın qırxılı olsaydı, boynunu vurmuşdum.”[177]

Peyğəmbər – salləllahu aleyhi va səlləm – deyib: “Mömin münaqəşə etməz və mən Qiyamət günü münaqəşə edənə şəfaət etməyəcəm. Xeyrinin azlığına görə münaqəşəni tərk edin!”[178]

**[143]** Bir kimsədə sünnətin xüsusiyyətlərinin bir arada olduğunu bilmədiyi təqdirdə müsəlman bir zatın o kəs haqqında “fılankəs sünnət əhlidir” deməsi halal deyildir. Sünnətin hamısı onda bir arada olmadığı müddətdə ona “sünnət əhlidir” deyilməz.

Abdullah bin əl-Mubərək deyib: “Yetmiş iki bidətin kökünü dörd bidət təşkil edir, beləliklə bu dörd bidətdən bu yetmiş iki bidət ayrılmışdır. (Bu dörd bidət bunlardır) : qədərilik, mürciəlik, şiəlik və xaricilik.”[179]

Kim Əbu Bəkri, Öməri, Osmanı və Əlini peyğəmbərin – salləllahu aleyhi va səlləm – digər səhabələrindən üstün tutarsa və digərləri haqqında yalnız

---

[175] Bunu İmam Əhməd ”əl-Musnəd”də (2/195-196; rəq: 6845-6846) və İbn Əbi Asim “əs-Sunnə”də (406) rəvayət ediblər. Şeyx əl-Albani “Ziləlul-Cənnə”də həsən sayıb.
[176] Ğafir, 4
[177] Ömərə bu sualı verən Sabiğ bin Useyl’dir. Bu ləfzi isə əl-Laləkai “İtiqad Əhlis-Sunnə”də (2/701-702; rəq: 1136) və İbn Asəkir tarixində (23/412) rəvayət edib. Bunu Şeyxul-İslam İbn Teymiyyə “əs-Sarim əl-Məslul” kitabında (2/356-367) səhih sayıb.
[178] Bunu ət-Tabərani ”əl-Mucəm əl-Kəbir”də (8/152; rəq: 7659), İbn Hibban “əl-Məcruhin”də (2/225-226) və İbn Asəkir tarixində (33/367-368) rəvayət edib. İbn Hibban hədisin ravisi Kəsir bin Mərvan haqqında deyir: “O, münaqəşə hədisinin sahibidir. Hədisləri çox münkərdir. Onu dəlil kimi istifadə və ondan rəvayət etmək olmaz, yalnız təəccüb üçün istifadə etmək istisnadır.” Beləliklə İbn Hibban hədisin münkər olduğunu demişdir.
[179] Bunu İbn Batta “əl-İbənə əl-Kubra”da (278) rəvayət edir.

xeyir söz söyləyərsə və onlara dua edərsə, şiəlikdən tamamilə qurtulmuşdur.

Hər kim “iman söz və əməldir, artar və azalar” deyərsə ircadan tamamilə qurtulmuşdur.

Hər kim “hər xeyirxah və hər facirin arxasında namaz caizdir və hər xəlifə ilə cihad vardır” deyərsə, qılınc ilə sultana qarşı çıxmağı caiz görmürsə və onların islah olmaqları üçün dua edirsə, xaricilərin görüşlərindən tamamilə qurtulmuşdur.

Qədərin hamısının xeyri və şərri ilə Allahdan olduğunu, Allahın dilədiyini azdırdığını və dilədiyini doğru yola yönəltdiyini deyən kimsə qədərilərin görüşündən tamamilə qurtulmuş olur və o, sünnət sahibidir.

***

**[144]** Peyda olmuş bir bidət vardır ki, Əzəmətli Allaha qarşı küfrdür, ona etiqad edən hər kəs kafirdir və bunda heç bir şəkk yoxdur: rac’ə inancına inanan və Əli bin Əbi Talibin diri olduğunu, Qiyamət günündən əvvəl onun və Muhamməd bin Əli, Cafər bin Muhamməd və Musa bin Cafərin qayıdacağını deyən, imamlar haqqında danışan, onların qeybi bidliklərini deyən kəslərdən uzaq dur, çünki onlar və bu görüşdə olanlar Əzəmətli Allaha qarşı kafirdirlər.

Tu’mə bin Amr[180] və Sufyan bin Uyeynə deyib: Kim Osman və Əlinin məsələsində durarsa o, şiədir, adil sayılmaz. Onunla danışılmaz və onunla oturub durulmaz. Əlini Osmandan üstün tutan isə rafizidir, peyğəmbərin – salləllahu aleyhi va səlləm – səhabələrinin qərarını tərk etmişdir.[181]

---

[180] Tu’mə bin Amr əl-Amiri əl-Kufidir. İbn Main onu etibarlı hesab edib. Hicri 168-ci ildə vəfat edib.

[181] Təhqiq əhli yanında ən doğru görüş budur ki, bu səbəblərə görə insan bidətçi olmaz və buna görə şəhadəti inkar olunmaz, əksinə əhli-sünnət alimləri içində bu görüşdə olanlar da vardır. əl-Hafiz İbn Həcər əl-Asqalani “Lisənul-Mizən” kitabında (1/314) İbrahim bin Abdil-Aziz bin əd-Dahhak haqqında danışarkən deyir: “Əbuş-Şeyx və sonra Əbu Nueym zikr edir ki, o, (yəni İbrahim bin Abdil-Aziz) hədis rəvayət etmək üçün

Onların dördünü hamısından üstün tutan, digərlərinə rəhmət oxuyan, onların xətaları haqqında susan bir kimsə bu məsələdə doğru yol və hidayət üzərindədir.

**[145]** Allahın elçisinin – salləllahu aleyhi va səlləm – cənnətlik olmaqlarına dair şahidlik etdiyi on şəxsin şəksiz, şübhəsiz Cənnətə girəcəklərinə dair şahidlik etmək sünnətdəndir.

**[146]** Fəqət Allahın elçisindən – salləllahu aleyhi va səlləm va alə əlihi – savayı heç kimsəni salavatda xüsusiləşdirmə![182]

**[147]** Bil ki, Osman bin Affən məzlum olaraq öldürüldü və onu öldürən zalım idi.

---

oturdu, fəzilətlər haqqında kitabı çıxartdı. Əbu Bəkrin, sonra Ömərin fəzilətlərini diktə etdi və sonra dedi: "Osman yoxsa Əli ilə başlayaq?" Dedilər: "Bu, rafizidir" və onun hədisini tərk etdilər. Deyirəm: Bu açıq-aşkar zülmdür, çünki bu, əhlus-sunnətdən bir qrup alimin məzhəbidir. Bununla o ikisindən birini o birindən üstün tutmaqda susmağı qəsd edirəm. Əksər alimlər Osmanı önə keçirsələr də əhlus-sunnətdən bir qrup alim Əlini Osmandan önə keçirərdi. Onlar arasında Sufyan əs-Səvri və İbn Xuzeymə yer alır."

[182] Bu məsələdə alimlər ixtilaf ediblər. Peyğəmbərdən – salləllahu aleyhi va səlləm – savayı başqa kiməsə ayrılıqda salavat diləmək olarmı? İmam İbn Kəsir təfsirində (6/477-478) deyir: "İxtilaf sadəcə olaraq peyğəmbərlərdən başqasına ayrılıqda salavat diləmək barəsindədir. Bir qrup deyib ki, bu, caizdir...Alimlərin əksəriyyəti isə deyib ki, peyğəmbərlərdən başqalarına ayrılıqda salavat göndərmək olmaz." Hənbəli məzhəbinin məşhur görüşünə görə peyğəmbərdən başqa kiməsə ayrılıqda salavat göndərmək caizdir. Şeyx Aləud-Din əl-Mərdəvi "ət-Təhbir Şərh ət-Təhrir" kitabında (1/104) deyir: "Məzhəbin səhih görüşünə görə peyğəmbərin adı çəkilmədən peyğəmbərlərdən – salavatullahi va sələmuhu aleyhim əcməin – başqasına təklikdə salavat göndərmək caizdir." Hənbəli alimlərinin əksəriyyətinin görüşü budur. Məcdud-Din İbn Teymiyyə, İbn Abdil-Qavi, İbn Təmim və İbn Həmdən bunu yalnız peyğəmbərin – salləllahu aleyhi va səlləm – adı ilə birlikdə caiz görüblər, ayrılıqda caiz görməyiblər. Bunu məkruh sayıblar. Şeyxul-İslam İbn Teymiyyə isə bunu bir şüar olaraq başqasına aid etməyi haram sayıb. Yəni peyğəmbərdən başqa hər hansı bir kəsi salavat ilə xüsusiləşdirərək bunu şüar etmək haramdır.

## (Bəzi sünnətlər və sünnətin əhəmiyyəti)

**[148]** Hər kim bu kitabdakıları təsdiq edər, onlara iman edər, onları özünə imam seçərsə və ondan bir hərfə belə şəkk etməzsə, ondan bir hərfi belə inkar etməzsə o, sünnət və camaat əhlidir, kamildir, onda sünnət tamamlanmışdır. Kim bu kitabdan bir hərfi inkar edərsə və ya ondan bir hərfə və ya (ümumilikdə) kitaba şəkk edərsə və ya (bu kitabı təsdiq etməkdən) çəkinərsə o, bidət sahibidir. Qurandan və ya peyğəmbərdən – salləllahu aleyhi va səlləm – gəlmiş bir hərfə şəkk edən və ya onu inkar edən hər bir kəs Allahu Təaləni Onu yalanlamış olaraq qarşılayacaq. Ona görə də Allahdan qorx, ehtiyatlı ol və imanınla razılıq içində ol![183]

**[149]** Bir kimsəyə, nə xeyir sahibinə, nə də insanların heç birinə Allaha qarşı asilikdə kömək etməmək sünnətdəndir. Allaha asi olmaqda bəşər övladına itaət etmək olmaz. Heç kəsin günah üzərində olmasını xoş görmə! Bunların hamısına Allah üçün – Təbərakə va Təalə - nifrət et!

**[150]** Böyük və kiçik günahlara görə Allaha – Azzə va Cəllə - tövbə etmək üçün bütün qulların üzərinə tövbənin fərz olmasına iman etmək.

**[151]** Allah elçisinin – salləllahu aleyhi va səlləm – cənnətlik olmasına dair şahidlik etdiyi bir kimsə üçün (onun Cənnətə girəcəyinə dair) şahidlik etməyən biri bidət və zəlalət sahibidir, Allahın elçisinin – salləllahu aleyhi va səlləm – dediyində şəkk edən biridir.

Malik bin Ənəs dedi: “Kim həmişə sünnətə bağlı olarsa və peyğəmbərin səhabələri onun (dilindən) salamat olarsa və sonra ölərsə, əməli qüsurlu

---

[183] Daha əvvəl də qeyd etdiyim kimi bu sözləri hərfi mənada anlamaq müşkildir, çünki Qurandan başqa heç bir kitab xətadan səlim deyildir. Üstəlik kitabın içində haqqında ixtilaf edilmiş fiqhi məsələlər də zikr edilib və bu cür fiqhi məsələlərdə müxalifi inkar etməzlər. Müəllifin bu şəkildə mübaliğəli sözlər tam qəsdinin nə olduğunu müəyyən etmək çətindir.

olsa belə (axirətdə) peyğəmbərlər, siddiqlər, şəhidlər və salehlər ilə birlikdə olacaq.”

Bişr bin əl-Haris[184] dedi: “İslam sünnətdir və sünnət də İslamdır.”

Fudeyl bin İyad dedi: “Sünnət əhlindən bir nəfəri görəndə sanki peyğəmbərin – salləllahu aleyhi va səlləm – səhabələrindən bir nəfəri görürəm. Bidət əhlindən bir nəfəri görəndə isə sanki münafiqlərdən birini görürəm.

Yunus bin Ubeyd dedi: “Bu gün sünnətə dəvət edənin halı təəccüblüdür, ondan da təəccüblü isə sünnətə icabət edib onu qəbul edənin (halıdır).”[185]

İbn Aun ölüm ayağında olarkən ölənə qədər “sünnət! sünnət! bidətdən uzaq durun!” sözlərini deyib durdu.

Əhməd bin Hənbəl dedi: “Əshabımdan bir nəfər öldü və yuxumda o, mənə göstərildi və dedi: “Əbu Abdilləhə deyin: “Sünnətə sarıl! Allahın məndən soruşduğu ilk şey sünnət oldu.”

Əbul-Aliyə[186] dedi: “Kim məstur olaraq sünnət üzərində ölərsə o, siddiqdir.”

Deyiblər ki, sünnətə sarılmaq qurtuluşdur.[187]

Sufyan əs-Səvri deyib: “Kim öz qulağı ilə bidət sahibinə qulaq asarsa, Allahın qorumasından çıxmışdır və bidətlərə tərk edilmişdir.”[188]

Davud bin Əbi Hind[189] deyib: “Allah – Təbərakə va Təalə - Musa bin İmrana vəhy etdi: Bidət əhli ilə oturma, əgər onlarla otursan və ona görə onların

---

[184] Bişr əl-Həfi adı ilə tanınır. İmamdır, zahiddir, təqva əhlidir. Hicri 227-ci ildə vəfat edib.

[185] Bunun bənzərini Əbu Nueym “əl-Hilyə” kitabında (3/21) rəvayət edir.

[186] Rafi bin Mihran Əbul-Aliyə ər-Riyəhi böyük bir imam, Quran müəllimi, hafiz və təfsir alimidir. Hicri 90 və ya 93-cü ildə vəfat edib.

[187] əd-Dərimi “əs-Sunən”də (1/58; rəq: 96), Əbu Nueym “əl-Hilyə”də (3/369) Zuhridən belə dediyini rəvayət edirlər: “Əvvəlki alimlərimiz deyərdilər: “Sünnətə sarılmaq qurtuluşdur.” Ömər bin Abdil-Aziz bir xütbəsində deyib: “Bildiniz ki, sünnət əhli belə deyərdi: “Sünnətə sarılmaq qurtuluşdur.” Bax: “Hilyətul-Əvliyə”, 5/346

[188] Bunu Əbu Nueym “Hilyətul-Əvliya” kitabında (7/26, 34) və İbn Batta “əl-İbənə əl-Kubra”da (444) rəvayət ediblər. Bu sözlər həm də Muhamməd bin ən-Nədr əl-Hərisi’nin də sözü olaraq nəql edilib.

[189] Davud bin Əbi Hind əl-Basri məşhur hafiz, fəqih və mufti olmuşdur. Hicri 140-cı ildə vəfat edib.

dediklərindən bir şey qəlbinə yapışarsa səni üz üstə cəhənnəm atəşinə ataram."[190]

əl-Fudeyl bin İyad deyib: "Bidət sahibi ilə oturana hikmət verilməz."[191]

(Yenə) əl-Fudeyl bin İyad deyib: "Bidət sahibi ilə oturma, çünki mən (buna görə) üzərinə lənət enəcəyindən qorxuram."[192]

əl-Fudeyl bin İyad (yenə) deyib: "Bidət sahibini sevənin Allah əməllərini boşa çıxarar və İslamın nurunu qəlbindən çıxarar."[193]

əl-Fudeyl bin İyad (yenə) deyib: "Kim bidət sahibi ilə oturarsa onu korluğa varis edər."[194]

əl-Fudeyl bin İyad (bir daha) deyib: "Bidət sahibini bir yolda görsən sən o yoldan başqası ilə get!"[195]

əl-Fudeyl bin İyad deyib: "Kim bidət sahibini təzim edərsə, İslamın dağılmasına kömək etmişdir. Kim bir bidətçinin üzünə gülərsə Allahın – Azzə va Cəllə - Muhammədə - salləllahu aleyhi va səlləm – endirdiyini əhəmiyyətsiz saymışdır. Kərimə'sini[196] bir bidətçiyə ərə verən kimsə isə onun nəslini kəsmişdir və bir bidətçinin cənazəsini izləyən isə oradan geri dönənə qədər Allahın qəzəbində olmağa davam edəcək."[197]

əl-Fudeyl bin İyad deyib: "Bir yəhudi ilə və bir nəsrani ilə yemək yeyərəm, amma bir bidətçi ilə yemərəm. Mənimlə bidət sahibi arasında dəmirdən bir qalanın olmasını istərəm."[198]

---

190 Bu sözlərin bənzəri Ata, Xuseyf əl-Cəzəri və Muhamməd bin Əsləmdən rəvayət olunub.
191 Bunu əl-Beyhəqi "Şuəbul-İman" (7/64; rəq: 9482), Əbu Nueym "əl-Hilyə"də (8/103) və Əbu Abdir-Rahmən əs-Suləmi "Tabəqat əs-Sufiyyə"də (səh: 9-10; rəq: 2) rəvayət edib.
192 əl-Beyhəqi "Şuəbul-İman"da (7/63-64) rəvayət edib.
193 Bunu Əbu Nueym "əl-Hilyə"də (8/103), İbn Batta "əl-İbənə əl-Kubra"da (440), əl-Həravi "Zəmmul-Kəlam"da (4/167; 947) rəvayət edib.
194 Əbu Nueym "əl-Hilyə"də (8/103) rəvayət edib.
195 Əbu Nueym "əl-Hilyə"də (8/103) və İbn Batta "əl-İbənə əl-Kubra"da (493) rəvayət edib. Bu söz həm də Yəhya bin Əbi Kəsirdən də gəlib.
196 Kərimə ilə qəsd olunan qızıdır.
197 Bunu Əbu Nueym "əl-Hilyə"də (8/103) rəvayət edib.
198 Eyni məsdər

əl-Fudeyl bin İyad dedi: “Allah bir adamın bir bidət sahibinə nifrət etdiyini bilərsə əməli az olsa belə onu bağışlayar. Bidət əhlinə kömək edən sünnət sahibi onun yalnız nifaqını artırır.”[199]

Hər kim bir bidət sahibindən üz döndərərsə Allah onun qəlbini iman ilə doldurar. Bidət sahibini danlayan kəsi isə Allah ən dəhşətli gündə əminliyə çıxardar. Bidət sahibini təhqir edəni isə Allah Cənnət yüz pillə yuxarı qaldırar.

Heç zaman bidət sahibini Allah üçün sevmə!

---

[199] Eyni məsdər

## İstifadə olunmuş ədəbiyyat


1. “əl-Aqidətut-Tahaviyyə”, ət-Tahavi, Dar İbn Həzm, birinci nəşr: 1416/1995, Beyrut
2. “əl-Arbəin fi Dələil ət-Təuhid”, əl-Həravi, birinci nəşr: 1404/1984
3. “Bəyən Təlbis əl-Cəhmiyyə”, İbn Teymiyyə, Məcmə əl-Məlik Fəhd, hirci 1426, Mədinə
4. “əl-Bidə van-Nəhyu anhə”, İbn Vaddah, Məktəbə İbn Teymiyyə, birinci nəşr, 1416/1995, Qahirə
5. “Cəmi Bəyən əl-İlmi va Fədlihi”, İbn Abdil-Bərr, Dar İbn əl-Cəvzi, birinci nəşr: 1414/1994, əd-Dəmməm
6. “əl-Cəmi li Əxləq ər-Ravi va Ədəbis-Səmi”, əl-Xatib əl-Bəğdədi, Məktəbətul-Məarif, birinci nəşr: 1403/1983, Riyad
7. “Cəmiul-Ulum val-Hikəm”, İbn Racəb, Muəssəsə ər-Risalə, səkkizinci nəşr: 1419/1999, Beyrut
8. “əl-Cənnətu van-Nər”, əl-Əşqar, Darun-Nəfəis, yeddinci nəşr: 1418/1998, Amman
9. “Cuzun fihi Turuq Hədis Lə Təsubbu Əshəbi”, İbn Həcər, Dar Ammər, birinci nəşr: 1408/1988, Amman
10. “Dər’u Təarud əl-Aql van-Nəql”, İbn Teymiyyə, Muhammməd bin Səud universiteti, ikinci nəşr: 1411/1991, Riyad
11. “Əhkəmul-Quran”, əl-Cəssas, Dar İhyə ət-Turas əl-Arabi/Muəssəsə ət-Tarix əl-Arabi, 1412/1992 Beyrut
12. “Əhkəmul-Quran”, İbnul-Arabi, Darul-Kutubil-İlmiyyə, üçüncü nəşr: 2003/1424, Beyrut

13. “Əhval əl-Qubur fi Əhvali Əhlihə ilən-Nuşur”, İbn Racəb, Dar əl-Kitəb əl-Arabi, üçüncü nəşr, 1414/1994, Beyrut

14. “Əxbər əl-Mədinə ən-Nəbəviyyə”, İbn Şəbbə, Dar əl-Kutub əl-İlmiyyə, hicri 1417, Beyrut

15. “əl-Əməli”, İbn Bəşran, Darul-Vatan, birinci nəşr: 1418/1997: Riyad

16. “əl-Ənsəb”, əs-Səmani, Darul-Cinən, birinci nəşr: 1408/1988, Beyrut

17. “Fəthul-Bari bi Şərh Sahih əl-Buxari”, İbn Həcər, Dar Taybə, birinci nəşr: 1426/2005, Riyad

18. “Fəthul-Bari Şərh Sahih əl-Buxari”, İbn Racəb, Məktəbətul-Ğurabə əl-Əsəriyyə, birinci nəşr: 1417/1996, Mədinə

19. “Firdəus əl-Əxbər”, əd-Deyləmi, Dar əl-Kitəb əl-Arabi, birinci nəşr: 1407/1987, Beyrut

20. “əl-Furu”, İbn Muflih, Muəssəsə ər-Risələ (və Dar əl-Muəyyəd), birinci nəşr: 1424/2003, Beyrut

21. “Hədi əl-Ərvah ilə Bilədil-Əfrah”, İbnul-Qayyim, Darul-Kutubil-İlmiyyə, birinci nəşr: 1403/1983, Beyrut

22. “Hilyətul-Əvliya”, İbn Nueym, Dar əl-Kitəb əl-Arabi, ikinci nəşr: 1387/1967, Beyrut

23. “əl-Huccə fi Bəyənil-Məhəccə”, Qavvamus-Sunnə, Dar ər-Rayə, birinci nəşr: 1411/1990, Riyad

24. “Xalq Əfalil-İbəd var-Raddu aləl-Cəhmiyyə va Əshəbit-Tatil”, əl-Buxari, Dar Ətləs əl-Xadra, birinci nəşr, 1425/2005, Riyad

25. “Xuləsatul-Əfkar Şərh Muxtəsaril-Mənar”, İbn Qutlubuğa, Dar İbn Kəsir/Darul-Kəlimit-Tayyib, birinci nəşr: 1413/1993, Beyrut

26. “əl-İbənə an Şəriatil-Firqatin-Nəciyə”, İbn Batta, Dar əl-Rayə, ikinci nəşr: 1415/1994, Riyad

27. “İğasətul-Ləhəfən min Məsayidiş-Şeytan”, İbnul-Qayyim, Mustafa əl-Bəbi əl-Hələbi, hicri 1357, Misir

28. “İbnul-Hənbəli va Kitəbuhu ər-Risələtul-Vadihə fir-Raddi aləl-Əşaira”, İbnul-Hənbəli, Məcmuətut-Tuhəfin-Nəfəisid-Dəuliyyə, birinci nəşr: 1420/1999, Riyad

29. “İqtida əs-Sirat əl-Mustəqim”, İbn Teymiyyə, Məktəbətur-Ruşd, dördüncü nəşr: 1414/1994, Riyad

30. “əl-İləl əl-Mutənəhiyə”, İbnul-Cəvzi, Dar əl-Kutub əl-İlmiyyə, birinci nəşr: 1402/1983, Beyrut

31. “əl-İnsaf”, əl-Mərdəvi, Dar İhyə ət-Turas əl-Arabi, birinci nəşr: 1374/1955, Misir

32. “İsləhul-Məl”, İbn Əbid-Dünya, Darul-Vafə, birinci nəşr: 1410/1990, Misir

33. “əl-İstizkər”, İbn Abdil-Bərr, Dar Quteybə/Dar əl-Vay, birinci nəşr: 1413/1993, Qahirə

34. “İthəfus-Sədətil-Muttəqin bi Şərhi İhyəi Ulumid-Din”, əz-Zubeydi, Muəssəsətut-Tərix əl-Arabi, ikinci nəşr: 1414/1994, Beyrut

35. “əl-İtiqad val-Hidəyətu ilə Səbilir-Raşəd”, əl-Beyhəqi, Darul-Fədilə, birinci nəşr: 1420/1999, Riyad

36. “Kitəbul-Arş”, əz-Zəhəbi, Darul-Kutubil-İlmiyyə, birinci nəşr: 1424/2003, Beyrut

37. “Kitəbul-Azamə”, Əbuş-Şeyx, Darul-Asimə, Riyad

38. “Kitəbul-Fitən”, Nueym bin Həmməd, Məktəbətut-Təvhid, birinci nəşr: 1412/1991, Qahirə

39. “Kitəbul-İmən”, İbn Əbi Şeybə, əl-Məktəb əl-İsləmi, ikinci nəşr: 1403/1983, Beyrut

40. “Kitəbul-Musəməra”, İbn Əbi Şərif, əl-Mətbəə əl-Kubra əl-Əmiriyyə, birinci nəşr: hicri 1317, Bulaq

41. “Kitəbut-Təuhid”, İbn Xuzeymə, Dar ər-Ruşd, birinci nəşr: 1408/1988, Riyad

42. “Ləvamiul-Ənvar əl-Bəhiyyə”, əs-Səffərini, Muəssəsə əl-Xafiqin, ikinci nəşr: 1402/1982, Dəməşq

43. “Lisənul-Mizən”, İbn Həcər, Məktəb əl-Mətbuat əl-İsləmiyyə (Dar əl-Bəşəir əl-İsləmiyyə), birinci nəşr: 1423/2002, Beyrut

44. “əl-Lubəb fi Təhzib əl-Ənsəb”, İbn əl-Əsir, Məktəbətul-Musənnə, birinci nəşr: 1390/1970, Bağdad

45. “Mədaricus-Səlikin”, İbnul-Qayyim, Muəssəsətul-Muxtar, birinci nəşr: 1422/2001, Qahirə

46. “əl-Məsəil əl-Aqadiyyə min Kitəbir-Ravayəteyn val-Vacheyn”, Əbu Yalə, Ədvaus-Sələf, birinci nəşr: 1419/1999, Riyad

47. “Məsəil İmam Əhməd”, Əbu Davud, Darul-Marifə, birinci nəşr: hicri 1353, Beyrut

48. “Məsəil İmam Əhməd”, İbn Həni, əl-Məktəbul-İsləmi, birinci nəşr: hicri 1394-1400 Beyrut

49. “Mətalib Ulin Nuhə fi Şərh Ğayətil-Muntəhə”, ər-Ruheybəni, əl-Məktəb əl-İsləmi, birinci nəşr: 1381/1961, Beyrut

50. “Minhəcus-Sunnətin-Nəbəviyyə”, İbn Teymiyyə, Cəmiətul-İməm Muhamməd bin Suud əl-İsləmiyyə, birinci nəşr: 1406/1986, Riyad

51. “Mizənul-İ’tidəl fi Nəqdir-Ricəl”, əz-Zəhəbi, Dar əl-Kutub əl-İlmiyyə, birinci nəşr: 1416/1995, Beyrut

52. “əl-Mucəm əl-Əvsət”, ət-Tabərani, Dar əl-Məarif, birinci nəşr: 1405/1985, Riyad

53. “əl-Muxtar fi Usulis-Sunnə”, İbnul-Bənna, Məktəbətul-Ulim val-Hikəm, birinci nəşr: 1413, Mədinə

54. “Muntəhə əl-İradət”, əl-Fətuhi, Muəssəsə ər-Risələ, birinci nəşr: 1419/1999, Beyrut

55. “əl-Muntəxab minəl-İləli lil-Xalləl”, İbn Qudamə, Darur-Rayə, birinci nəşr: 1419/1998, Riyad

56. “əl-Musannəf”, İbn Əbi Şeybə, Darul-Qiblə - Muəssəsə Ulumil-Quran, birinci nəşr: 1427/2006, Cuddə

57. “əl-Musəməra bi Şərhil-Musəyəra”, İbn Əbi Şərif; əl-Mətbəə əl-Kubra əl-Əmiriyyə, birinci nəşr: hicri 1317, Bulaq

58. “əl-Musvaddə fi Usul əl-Fiqh”, Al Teymiyyə; Mətbəə əl-Mədəni, 1384/1964, Qahirə

59. “əl-Mutəməd fi Usulid-Din”, Əbu Yalə, Dar əl-Məşriq, birinci nəşr: 1394/1974, Beyrut

60. “Nəqd Təsis əl-Cəhmiyyə”, İbn Teymiyyə, Mətbəətul-Hukumə, birinci nəşr: hicri 1392, Məkkə

61. “ən-Nubəz alə Şərhis-Sunnəti lil-Bərbəhəri”, əl-Ubeylən, Dar Ğaras, birinci nəşr: 1423/2003, Küveyt

62. “ər-Raddu aləl-Cəhmiyyə”, əd-Dərimi, əd-Dar əs-Sələfiyyə, birinci nəşr: 1405/1985, Küveyt

63. “ər-Ruh”, İbnul-Qayyim; Dar əl-Kutub əl-İlmiyyə, birinci nəşr: 1402/1982, Beyrut

64. “Sahih əl-Buxari”, əl-Buxari, Dar əs-Sələm, birinci nəşr: 1417/1997, Riyad

65. “Sahih Muslim”, Muslim, Dar İhyə əl-Kutub əl-Arabiyyə, birinci nəşr: 1374/1955, Qahirə

66. “Sahih Muslim bi Şərh ən-Nəvəvi”, ən-Nəvəvi, əl-Mətbəə əl-Misriyyə bil-Əzhar, birinci nəşr: 1349/1930, Misir

67. “əs-Siqat”, İbn Hibbən, Mətbəətu Məclis Dəiratul-Məarif əl-Usməniyyə, birinci nəşr: 1402/1982, Heydərabad

68. “Siyər Əaləm ən-Nubələ”, əz-Zəhəbi, Muəssəsə ər-Risələ, doqquzuncu nəşr: 1413/1993, Beyrut

69. “əs-Sunnə”, Abdullah bin Əhməd, Dar Aləm əl-Kutub, dördüncü nəşr: 1416/1996, Riyad

70. “əs-Sunnə”, əl-Xalləl, Dar ər-Rayə, birinci nəşr: 1410/1989, Riyad

71. “Şərh Məzəhib Əhlis-Sunnə”, İbn Şəhin, Muəssəsə Qurtubə, birinci nəşr: 1415/1995, Qahirə

72. “Şərh Sunəni Əbi Davud”, al-Ayni, Məktəbətur-Ruşd, birinci nəşr: 1420/1999, Riyad

73. “Şərhus-Sunnə”, əl-Bəğavi, əl-Məktəb əl-İsləmi, ikinci nəşr: 1403/1983, Beyrut

74. “Şərhus-Sunnə”, əl-Bərbəhəri, təhqiq Abdur-Rahmən əl-Cəmizi, Məktəbətu Dar əl-Minhəc, birinci nəşr: 1426, Riyad

75. “Şərhus-Sunnə”, əl-Bərbəhəri, təhqiq Xalid ər-Raddədi, Məktəbətul-Ğurabə əl-Əsəriyyə, birinci nəşr: 1414/1993, Mədinə

76. “Şərhul-Aqidatit-Tahaviyyə”, İbn Əbil-İzz, Muəssəsə ər-Risalə, ikinci nəşr: 1411/1990, Beyrut

77. “Şərh Usul İtiqad Əhlis-Sunnə val-Cəməa”, əl-Laləkai, Dar Taybə, dördüncü nəşr: 1416/1995, Riyad

78. “əş-Şəri’ah”, əl-Acurri, Muəssəsə Qurtubə, birinci nəşr: 1416/1996, Qahirə

79. “Şuab əl-İmən”, əl-Beyhəqi, Dar əl-Kutub əl-İlmiyyə, birinci nəşr: 1410/1990, Beyrut

80. “Tabəqat əl-Hənəbilə”, İbn Əbi Yalə, Məktəbətul-Məlik Fəhd, ikinci nəşr: 1419/1999, Riyad

81. “Təfsir əl-Quran əl-Azim”, İbn Kəsir, Dar Taybə, ikinci nəşr: 1420/1999, Riyad

82. “ət-Təhbir Şərh ət-Təhrir”, əl-Mərdəvi, Məktəbətur-Ruşd, birinci nəşr: 1421/2000, Riyad

83. “Təhzibus-Sunən”, İbul-Qayyim, Məktəbətul-Məarif, birinci nəşr: 1428/2007, Riyad

84. “ət-Təxvif minən-Nər”, İbn Racəb, Məktəbətul-Muəyyəd – Məktəbətu Daril-Bəyan, ikinci nəşr: 1409/1988, Dəməşq

85. “Təqrirul-Qavaid va Təhrirul-Favaid”, İbn Racəb, Dar İbn Affən, birinci nəşr: 1424/2003, Qahirə

86. “ət-Təqrir vat-Təhbir fi Şərhi Kitəbit-Təhrir”, İbn Əbil-Həcc, əl-Mətbəə əl-Kubra əl-Əmiriyyə, birinci nəşr: 1317/1900, Bulaq

87. “Təlxisul-Həbir fi Təxrisi Əhədisir-Rafi’i əl-Kəbir”, İbn Həcər, Muəssəsə Qurtubə, birinci nəşr: 1416/1995

88. “ət-Təmhid fi Usulil-Fiqh”, Əbul-Xattab, Cəmiatu Ummil-Qura, birinci nəşr: 1406/1985, Məkkə

89. “ət-Təmhid”, İbn Abdil-Bərr, Vazəratuş-Şuun əl-İsləmiyyə, 1407/1987, Mərakeş

90. “ət-Tərix əl-Kəbir”, əl-Buxari, Dairatul-Məarif əl-Usməniyyə, hicri 1361, Heydərabad

91. “Tərix ət-Turas əl-Arabi, Sezkin, Muhamməd bin Suud universiteti, 1411/1911, Riyad

92. “Təvdih əl-Məqasid va Təshih əl-Qavaid fi Şərh Qasidətil-İməm İbn əl-Qayyim”, Əhməd bin İbrahim, əl-Məktəb əl-İsləmi, ikinci nəşr: 1394, Beyrut

93. “Təvil Muxtələf əl-Hədis”, İbn Quteybə, əl-Məktəb əl-İsləmi/Muəssəsətul-İşraq, ikinci nəşr: 1419/1999, Beyrut

94. “Tuhfətut-Talib bi Marifəti Əhədis Muxtəsar İbn Həcib”, İbn Kəsir, Dar Hira, birinci nəşr: 1406, Məkkə

95. “Usul əd-Din”, əl-Bəzdəvi, əl-Məktəbə əl-Əzhariyyə lit-Turas, 1424/2003, Qahirə

96. “Yəqzatu Ulil-İ’tibər”, əl-Qanuci, Məktəbətu Atif – Darul-Ənsar, birinci nəşr: 1398/1987, Qahirə

97. “əz-Zəvacir an İqtiraf əl-Kəbəir”, əl-Heytəmi, əl-Mətbəə əl-Xayriyyə, hicri 1284, Misir